Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «…Allah sura ikinci dəfə üfləmə əmrini verdikdə İsrafil - *əleyhissəlam* - sura üflədikdə Allahın dilədiyi kimsələrdən başqa hər kəs ölür. Canları alındıqdan sonra Ölüm mələyi Güc və Qüdrət sahibi Allahın hüzuruna gələrək: «Ya Rəbb! Göylərdə və yerdə sənin dilədiyindən başqa hər kəs ölmüşdü» deyər. Allah: «(Allah hər şeyi bildiyi halda) Həyatda kim qaldı?» deyə buyurar. Mələk: «Ya Rəbb! Ölməz və diri olan Sən həyatda qaldın, ərşi daşıyanlar, Cəbrail, Mikail və mən». Deyər. Allah: «Cəbrail və Mikail də ölsünlər!» deyə buyurar. Canları alındıqdan sonra Ölüm mələyi Güc və Qüdrət sahibi Allahın hüzuruna gələrək: «Ya Rəbb! Cəbrail və Mikail də öldülər. Mən və ərşi daşıyanlar həyatda» deyər. Allah: «Ərşimi daşıyanlar da ölsünlər» deyə buyurar. Ərşi daşıyanlar da ölürlər. Uca Allah ərşə əmr verir ərş suru İsrafildən alır. Bundan sonra Ölüm mələyi Güc və Qüdrət sahibi Allahın hüzuruna gələrək: «Ya Rəbb! Ərşi daşıyan mələklər də öldülər» deyər. Allah: «(Allah hər şeyi bildiyi halda) Həyatda kim qaldı?» deyə buyurar. Mələk: «Ya Rəbb! Ölməz və diri olan Sən həyatda qaldın və bir də mən» deyər. Allah: «Sən də öl» deyə əmr verər. Ölüm mələyi də ölür…»[29]. Lakin onların surdan öncə ölmələri barəsində bir məlumat yoxdur. *Doğrusunu Allah bilir!*

## ***Mələklərin Möhtərəm Və Müti (İtaətkar) Olmaları***

***"Bu səhifələr elçilərin əllərində, möhtərəm və müti olanların əllərindədir". (Əbəsə 15-16).*** Buxari – *rahmətullahi aleyhi* - deyir ki: "Allah onları Səfəra – *Səfir* – barışdıran adlandırmışdı. Çünki onlar Allahın əmr və vəhyi ilə xalqlar arasında sülh quran səfirlər kimi insanların arasına nazil olurlar"[30]. Bunu isə Qurani Kərimi sinələrdə daşıyan kimsənin ədalətli və müdrik olması ilə əlaqələndirmək olar. Aişə – *radıyallahu anhə* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Quran oxuyan

---

[29] Əbu Yala «Musnəd», Təbəri «Təfsir», Beyhəqi «Bas vən Nuşur» 327.
[30] İbn Həcər "Fəthl Bəri" 8/691.

və onu əzbərdən bilən adam möhtərəm və müti mələklərlə eyni dərəcədədir. Çətinlik çəkə-çəkə daim Quran oxuyan adam isə iki savab qazanır"[31].

## Mələklərin Həyalı Olmaları

Mələklər Həya və utanmaq kimi sifətlərə sahibdilər. Aişə – *radıyallahu anhə* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ayaqları baldıra (və ya diz qapaqlarına) qədər açıq vəziyyətdə uzanmışdı. Əbu Bəkr, Ömər – *radıyallahu anhum* – onun yanına içəri girdikdə o, ayaqlarının üstünü örtmədi. Lakin Osman – *radıyallahu anhu* – onun yanına girən kimi ayaqlarının üstünü örtdü. Niyə belə etdiyini soruşduqda: «Mələklərin həya etdiyi bir kəsdən mən necə həya etməyim»[32].

## Mələklərin Surətlərini Dəyişmələri

Allah mələklərə surətlərini dəyişərək başqa surət almalarına izn vermişdir. ***"Kitabda Məryəmi də yada sal. O zaman o, ailəsindən ayrılıb şərq tərəfdə olan bir yerə çəkilmiş və ibadət vaxtı onlardan gizlənmək üçün pərdə tutmuşdu. Biz Öz Ruhumuzu (Cəbraili) onun yanına göndərdik. O, Məryəmin qarşısında kamil bir insan surətində peyda oldu. Məryəm dedi: "Mən səndən Mərhəmətli Allaha sığınıram! Əgər müttəqisənsə, mənə toxunma". Mələk dedi: "Mən sənə ancaq pak bir oğlan bəxş etmək üçün Rəbbinin elçisiyəm". (Məryam 16-19). «Həqiqətən elçilərimiz (mələklər) İbrahimin yanına müjdə ilə gəlib salam verdilər. İbrahim də: «Salam!» deyə cavab verdi və dərhal (gedib onlara) qızardılmış bir buzov gətirdi. İbrahim (qonaqların) əllərini yeməyə uzatmadıqlarını gördükdə onların bu hərəkəti xoşuna gəlmədi və qorxuya düşdü». (Hud 69-70). "Elçilərimiz Lutun yanına gəldikdə, onlara görə kədərləndi, ürəyi sıxıldı və: "Bu, çox çətin bir gündür"– dedi. (Hud 77).*** İbn Kəsir – *rahmətullahi aleyhi* - deyir ki: "Mələklər Lut - *əleyhissəlam* - ın yanına gözəl bir gənc oğlan surətində gəlmişdilər...". Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, bir gün

---

[31] Buxari 4937, Müslim 798, Tirmizi 2904.

[32] Müslim 2401.

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - in hüzurunda oturmuşduq. Bu vaxt paltarı düm ağ, saçları olduqca qara, üzərində heç bir səfər əlaməti görünməyən və aramızda heç kimsənin tanımadığı bir nəfər içəri girib, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - in yanında oturdu. İki dizini onun dizlərinə söykəyib, əllərini dizlərinin üzərinə qoyaraq dedi: «Ey Muhəmməd, mənə İslam haqqında xəbər ver!». Peyğəmbər: «İslam, Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına, Muhəmmədın Allahın Rəsulu olduğuna şəhadət etmək, namaz qılmaq, zəkat vermək, Ramazanda oruc tutmaq, Kəbəni (imkan olduqda) həcc etməkdir» deyə buyurdu. (Adam): «Doğru söylədin, dedi». (Ömər) dedi ki, adama heyrət etdik. Həm ona sual verir, həm də onun söylədiklərinin doğru olduğunu təsdiq edirdi. (Yenə) soruşdu: «Mənə İman haqqında xəbər ver!». (Peyğəmbər): «(İman) Allaha, mələklərinə, kitablarına, peyğəmbər-lərinə, axirət gününə və qədərin xeyir və şərridə Allahdan olmasına inanmaqdır» deyə buyurdu. (Adam): «Doğru söylədin. Mənə ehsan haqqında xəbər ver!» dedi. «(Ehsan) Allaha onu görür kimi ibadət etməkdir. Sən Onu ğörməsən də, O səni görür». (Adam): «Mənə Qiyamət günü haqqında xəbər ver!» dedi. (Peyğəmbər): «Bu haqda soruşulan soruşandan (elimli deyildir) cox bilmir». (Adam): «Onda mənə onun əlamətləri haqqinda xəbər ver» dedi. (Peyğəmbər): «Qul qadının öz ağasını doğması, ayaq yalın, çılpaq, çobanların hündür bina tikməkdə bir-birləri ilə yarışmaları» deyə buyurdu. (Ömər) dedi ki, sonra o, adam çıxıb getdi. Bir müddətdən sonra (Peyğəmbər) mənə buyurdu: «Ey Ömər, o sual verənin kim olduğunu bilirsənmi?». Allah və Rəsulu daha gözəl bilir. (Peyğəmbər) buyurdu: «O, Cəbrail – *əleyhissəllam* - idi. Sizə dininizi öyrətməyə gəlmişdi»[33]. Aişə - *radıyallahu anhə* – Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in əlini Dihyənin atının yüyəninə qoyaraq danışdığını gördü. Ondan bu barədə soruşduqda

---

[33] Müslim 8.

Peyğəmbər: "Bu Cəbrail - *əleyhissəlam* - idi, sənə Salam göndərir"[34]. Həmçinin – Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah İsrail oğullarından cüzəm xəstəliyinə tutulanı, keçəli və koru imtahan etmək üçün yanlarına bir mələk göndərir..."[35].

Mələklərin surətlərini dəyişərək insan surətini, formasını necə almaları barəsində isə heç bir məlumat yoxdur. Bu barədə fikir yürütmək və mülahizələr aparmaq isə boş bir şeydir. Allah və Rəsulunun bu barədə xəbər verdiyi ilə kifayətlənmək lazımdır.

## ***Mələklərin Surəti***

İnsanlara məlum olan ən surətli surət işıq surətidir. Saniyədə **186 000** mil. Mələklər isə bundan da surətli olaraq hərəkət edirlər. İnsanların bunu dərk etməsi, hər hansısa bir cihazla ölçmələri mümkün deyildir. Çünki insanlar Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə sual verdikləri zaman dərhal Cəbrail – *əleyhissəllam* - Rəbbindən onun cavabını Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə bildirirdi. ***Həmçinin*** – Ölüm mələyinin dünyanın bir neçə bölgəsində insanların canlarını alaması və s. Ağıl ilə müqayisə ediləsi bir şey deyildir. Lakin bəzi cahil kimsələr bu kimi şeyləri inkar edərək (öz ağılları) ilə: "Necə ola bilər ki, mələk bir anda bir neçə insanın canını alsın". Subhənəllah! Belələrinə cavabımız odur ki: "Onları – Təyyarənin surətini öz surəti ilə müqayisə etmək istəyən ağcaqanada bənzətmək olar". Mələklərin dünyası insanların dünyasından tam fərqlidir. *Allah daha doğru bilir!.*

## ***Mələklərin Elmi***

***"Allah Adəmə bütün şeylərin adlarını öyrətdi Sonra onları mələklərə göstərib dedi: "Doğru danışanlarsınızsa, bunların adlarını Mənə deyin!" Onlar dedilər: "Sən pak və müqəddəssən! Sənin bizə öyrətdiklərindən başqa bizdə heç bir bilik yoxdur! Həqiqətən, Sən Bilənsən, Müdriksən!". (əl-Bəqərə 31-31). "Onlar sizin nə etdiklərinizi bilirlər". (əl-İnfitar 12).***

---

[34] Əhməd "Musnəd" 24462, 25174, 25195, İbn Sad "Tabaqat", Şueyb Arnavut "Zəif". Buxari 3217, 3768.

[35] Buxari 3464, Müslim 2964.

## ***Mələklərin Mübahisəsi***

Mələklərin Mübahisəsi hədisdə bəyan edilir: Muaz İbn Cəbəl, İbn Abbas - *radıyallahu anhum* – demişdir: «(Bir dəfə) Allah Elçisi – *sallallahu aleyhi və səlləm* – Sübh namazına gecikirdi, hətta az qala günəş çıxacaqdı. Birdən tələsik gəldi və namaza iqamə verildi. Allah Elçisi – *sallallahu aleyhi və səlləm* – namazı yüngül qıldırdı. Salam verdikdən sonra uca səslə: «Sıralarda olduğunuz kimi qalın!» - dedi. Sonra bizə tərəf dönərək buyurdu: «Sübhə gecikməyimin səbəbini sizə söyləyəcəyəm. Gecə qalxıb dəstəmaz aldım və mənə təqdir olunan qədər namaz qıldım. Birdən namazımda mürgülədim, hətta yuxum ağırlaşdı və mən bu arada Uca və Ulu Rəbbimi ən gözəl surətdə gördüm. O buyurdu: «Ey Muhəmməd!» Mən dedim: «Əmrinə müntəzirəm, ey Rəbbim!» Allah buyurdu: «Mələklər nə haqda mübahisə edirlər?» Mən dedim: «Bilmirəm!» Bunu üç dəfə təkrarladı. Rəbbim ovcunu iki çiynimin (kürək sümüyümün) arasına qoydu, hətta barmaq uclarının (Başqa rəvayətdə: əlinin) sərinliyini sinəmdə (köksümdə) hiss etdim. Hər şey mənə göründü və hər şeyi bildim (Başqa rəvayətdə: Məşriq və Məğrib arası hər bir şeyi bildim). Allah buyurdu: «Ey Muhəmməd!» Mən dedim: «Əmrinə müntəzirəm, ey Rəbbim!» Allah buyurdu: «Mələklər nə haqda mübahisə edirlər?» Mən dedim: «Kəffarələr haqqında». O buyurdu: «Nədir onlar?» Mən dedim: «Cəmaat namazlarına piyada getmək, namazlardan sonra məscidlərdə oturub növbəti namazı gözləmək, soyuqda dəstəmazı tam almaq (Başqa rəvayətdə: Kim belə edərsə xeyirlə yaşayar, xeyirlə ölər və hər cür günah və xətalardan uzaq olaraq anadan doğulduğu kimi tərtəmiz olar)». Allah buyurdu: «Sonra nə haqda?» Mən dedim: «Yemək yedirtmək, mülayim söz söyləmək, insanlar yatdığı vaxt namaz qılmaq». Allah buyurdu: «İstə!» Mən dedim: «Allahım! Səndən xeyir işlər görməyi, pis işlərdən uzaq olmağı, kasıbları sevməyi, məni bağışlamağını, mənə rəhm etməyini və hər hansı bir qövmü fitnəyə salmaq istədikdə, fitnəyə düşməmiş canımı almağını diləyirəm. Səndən Sənin və Səni

sevənin məhəbbətini qazanmağımı və məhəbbətinə yaxınlaşdıracaq hər bir əməli sevməyi istəyirəm» - (Allahummə inni əs'əlukə fi'ləl-xeyrati va tərkəl-munkərati va hubbəl məsəkini va ən təğfira li və tərhəməni va izə əradtə fitnətə qaumin fətəvaffəni ğeyra məftunin. Əs'əlukə hubbəkə va hubbə mən yuhibbukə və hubbə aməlin yuqarribu ilə hubbikə). Allah Elçisi – *sallallahu aleyhi və səlləm* – dedi: «Bu yuxu haqdır, bunları yaxşıca öyrənin»[36].

## ***Mələklərin Nizam-İntizamı Və Rəbləri Qarşısında Səf-Səf Durmaları***

Mələklər Rəbblərinə ibadət edərlər və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onlardan nümunə götürməyi bizlərə əmr etmişdir. Cabir - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bizləri halqalar halında gördükdə buyurdu: "Nə üçün sizi dağınıq cəmaatlar halında görürəm? Mələklərin Rəbbləri qatında səf-səf durduqları kimi nə üçün durmursunuz?". Biz: "Ya Rəsulullah! Mələklər Rəbbləri qatında necə səf-səf dururlar" dedik. O: "Onlar ilk Səfi doldurar və səfdə sıx durarlar"[37]. ***"Sənin Rəbbin və səf-səf düzülmüş mələklər gələcək". (əl-Fəcr 22). "Ruh (Cəbrail) və mələklər səf-səf duracağı gün, Mərhəmətli Allahın izin verdiyi kimsələrdən və doğru söz deyənlərdən başqa heç kəs danışmayacaq". (ən-Nəbə 38).*** Allahın əmrini necə də gözəl yerinə yetirirlər: Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günündə Cənnətin qapısına gələcəyəm və qapının açılmasını istəyəcəyəm». Mənə: «Sən kimsən?» deyə soruşacaqlar. Mən də: «Muhəmməd!» deyəcəyəm. O, da: «Mənə sənin adın verildi. Səndən əvvəl heç kəs üçün qapını açmamaqla əmr olundum»[38]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "...Sonra Cəbrail – *əleyhissəlam* – ilə birlikdə dünya səmasına yüksəldim. Birinci səmanın (qapılarına) yaxınlaşdıq. Cəbrail – *əleyhissəlam* – (qapıların) açılmasını istədi. Gözətçilər: «Kimdir O?»

---

[36] Tirmizi 3233, 3234, 3235, 3543, əl-Albani «Ziləlul-Cənnə» 388.
[37] Müslim 430.
[38] Müslim 197.

deyə soruşdular. «Cəbrail» dedi. Gözətçilər: «Yanında kim var?» deyə soruşdular. Cəbrail: «Muhəmməd!» deyə cavab verdi. Gözətçilər: «Ona risalət verildimi? (Yəni ona bura gəlsin deyə dəvət göndərildimi?)» deyə soruşdular. Cəbrail: «Bəli!» dedi. Bu dəfə: «Səfa gəldi, xoş gəldi!» deyildi və onun üçün səma (qapısı) açıldı...Beləcə hər bir səma qapısında izn alındı"[39].

## Mələklər Günah Etməkdən Uzaqdırlar

Qadi İyyad – *rahmətullahi aleyhi* - deyir ki: "Müsəlmanlar ittifaq ediblər ki, mələklərdən olan elçilər Peyğəmbərlər kimi günahlardan uzaqdırlar (Məsumdurlar). Lakin ixtilaf elçi olmayan məlklərin günahsız olub olmamalarındadır. Bir qrup qeyd edir ki: Mələklərin heç bir günah etmir və dəlil olaraq: ***"Ey iman gətirənlər! Özünüzü və ailənizi yanacağı insanlar və daşlar olan oddan qoruyun! Onun başı üstündə Allahın onlara verdiyi əmrlərə heç vaxt asi olmayan, özlərinə buyurulanları yerinə yetirən amansız və güclü mələklər vardır". (ət-Təhrim 6). "Mələklər dedi: "Bizlərdən hər kəsin müəyyən bir yeri vardır. Həqiqətən, biz səf-səf dururuq. Həqiqətən, biz Allahın şəninə təriflər deyirik". (əs-Saffat 164-166). "Göylərdə və yerdə kimlər varsa, hamısı Onundur. Onun yanında olanlar Ona ibadət etməyə təşəxxüs göstərmir və bundan yorulmurlar". (əl-Ənbiya 19). "Ona yalnız pak olanlar toxunur". (əl-Vaqiə 79).*** Digər qrup deyir ki: "Bu ayələr yalnız Elçi olan mələklərə aiddir. Onlar Harut və Marutu, İblisi misal çəkirlər". Lakin bu rəy zəif rəydir. Daha doğru olan isə mələklərin günah etməkdən uzaq olmalarıdır. Onlar Rəblərinə heç bir zaman asi olmurlar. Harut və Marut barəsində bizə nə səhih, nə də zəif bir hədis gəlməyib. O, ki qaldı İblisə - alimlərin əksəriyyəti qeyd edirlər ki, o mələk olmayıb. Adəm ilk insan olduğu kimi, o da cinlərin ilkidir"[40]. ***"Allah peyğəmbərliyini kimə verəcəyini daha yaxşı bilir". (əl-Ənam 124).***

## Mələklərin Təbiəti

---

[39] Buxari "Riqaq" 51, Müslim 2357, 2736.
[40] İmam Suyuti "Xabaik Fi Əxbər əl-Mələik" səh: 252.

Allaha itaət onların təbiətindədir. *“...**Onun başı üstündə Allahın onlara verdiyi əmrlərə heç vaxt asi olmayan, özlərinə buyurulanları yerinə yetirən...”. (ət-Təhrim 6).*** Adəm övladlarının üzərinə düşən məsuliyyət (yük) onların üzərinə düşməmişdir. ***“...Onun qorxusundan tir-tir əsirlər”. (əl-Ənbiya 28).***

## Mələklərin Yüksək Məqamı

Onların itaətkarlığı – Rəbblərindən qabaq danışmaz, Ona nəsihət verməz, əmri yerinə yetirmək üçün hazırdılar. ***“Kafirlər: "Mərhəmətli Allah Özünə övlad götürdü!"– dedilər. O, pakdır, müqəddəsdir! Əksinə, o mələklər möhtərəm qullardır. Mələklər Ondan qabaq danışmazlar; onlar ancaq Onun əmrini yerinə yetirərlər. Allah onların keçmişini və gələcəyini bilir. Onlar yalnız Onun razı qaldığı şəxslərdən ötrü şəfaət diləyir və Onun qorxusundan tir-tir əsirlər. Onlardan kimsə: "Mən Ondan başqa bir məbudam!"– desə, ona Cəhənnəmi qismət edərik. Biz zalımları belə cəzalandırırıq”. (əl-Ənbiya 26-29).*** İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Cəbrail – *əleyhissəlam* – buyurdu: Nə üçün sən bizi tez-tez ziyarət etmirsən?”. O: ***“Mələklər dedi: "Biz dünyaya ancaq sənin Rəbbinin əmri ilə enirik. Önümüzdə, arxamızda və onların arasında nə varsa, Ona məxsusdur. Rəbbin unudan deyildir". (Məryəm 64)[41].***

## Mələklərin Allahı Tərif Etmələri

***«Ərşi daşıyanlar və onun ətrafında olanlar (mələklər) öz Rəbbini həmd-səna ilə təqdis edir, ona inanır və möminlərin baığışlanmasını diləyərək belə deyirlər: «Ey Rəbbimiz! Sənin rəhmin və elmin hər şeyi ehtiva etmişdir. Artıq tövbə edib sənin yolunla gedənləri bağışla, onları cəhənnəm əzabından qoru». (əl-Mumin 7). “Onlar gecə-gündüz, usanmadan Onun şəninə təriflər deyirlər”. (əl-Ənbiya 20). “Mələklər də Rəbbinə həmd ilə təriflər deyir...”. (əş-Şura 5). “Həqiqətən, biz Allahın şəninə təriflər deyirik". (əs-Saffat 166).*** Nə üçün onlar bu qədər çox Rəbbinin

[41] Buxari 3218.

şəninə tərilər deyib onu təqdis edirlər? Çünki bu ən gözəl Allahı tərif etməyin formasıdır. Əbu Zərr - *radıyallahu anhu* – rəvayət edir ki, Anam atam sənə fəda olsun, ey Allahın Elçisi! Hansı söz Allaha daha sevimlidir?» - dedi. Allah Elçisi – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allahın öz mələkləri və qulları üçün seçdiyi: Subhənəllahi və Bihəmdihi - Rəbbim pak və müqəddəsdir, həmd Onadır! - sözüdür»[42].

## ***Mələklərin İbadəti***

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Meraca gedərkən ona səmadakı Beytul Məmur göstərildi. Mən: "Ey Cəbrail! Bu nədir?". O: "Bu Beytul Məmurdu" dedi. Hər gün yetmiş min mələyin ibadət edib, oradan çıxdıqdan sonra bir daha ora qayıtmamaqları bildirilmişdi[43]. ***"And olsun Beytulməmura!". (ət-Tur 4).*** İbn Kəsir – *rahmətullahi aleyhi* - deyir ki: "Allah bu evi Beytul Məmur – Dolmuş, doldurulmuş ev adlandırmışdır. Mələklər həmən evin ətrafında ibadət edər və onu insanların Kəbəni təvaf etdikləri kimi təvaf edərlər. Beytul Məmur yeddinci səmada olanların Kəbəsidir. Beytul Məmur düz Kəbənin üzərindədir. Əgər yerə düşsə düz Kəbənin üzərinə düşəcəkdir. Həmçinin hər bir səmada da ev vardır. Səma əhli ibadət zamanı ona üz tuturlar. İlk səma qatında olan ev isə: Beytul İzzə - Əzəmət evi adlanır". Xalid İbn Arar deyir ki, bir kişi Əli İbn Əbu Talib - *radıyallahu anhu* – dan soruşdu: "Beytul Məmur nədir?". O: "Kəbənin üzərində yerləşən, Səmada olan ibadətgahdır. Onun müqəddəsliyi Kəbənin yerdə olan müqədəsliyi kimidir. Hər gün yetmiş min mələk ora girərək ibadət edib, oradan çıxdıqdan sonra bir daha ora qayıtmırlar"[44]. Qatadə - *radıyallahu anhu* – rəvayət edir ki, bir gün Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – səhabələrə buyurdu: "Bilirsinizmi Beytul Məmur nədir?". Onlar: "Allah və Rəsulu daha gözəl bilir". O, səmada olan

---

[42] Müslim 2731, 7101.

[43] Buxari 3207, Müslim 162, 429.

[44] İbn Həcər "Fəthul Bəri" 6/308, Təbəri, əl-Albani "Səhih Silsilə" 1/236, H. 477.

məsciddir hansıki onun altında Kəbə yerləşir. Əgər o, düşsə düz (Kəbənin) üzərinə düşəcəkdir"[45].

## Mələklərin Qorxusu

Mələklər öz Rəbblərini yaxşı tanıyırlar. Buna görə də Onun qorxusundan hüzurunda tir-tir əsirlər. ***"...Onun qorxusundan tir-tir əsirlər". (əl-Ənbiya 28). "Göylərdə və yerdə olanların hamısı, heyvanlar da, mələklər də təkəbbür göstərmədən Allaha səcdə qılırlar. Onlar özlərinin fövqündə olan Rəbbindən qorxur və onlara əmr olunanları yerinə yetirirlər". (ən-Nəhl 49-50).*** Əbu Hureyra - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – demişdir: "Allah göydə bir iş barəsində qərar verdiyi zaman mələklər Onun əmrinə müntəzir olduqlarını bildirərək qanadlarını çarpırlar (və bu vaxt elə bir səs gəlir ki,) sanki (bir topa) zənciri qayaya çırpırlar. Nəhayət, ***"Mələklərin qəlbindən qorxu keçib getdikdə onlar: "Rəbbiniz nə buyurdu?"– deyə soruşurlar...". (əs-Səba 23).*** Onlara belə cavab verilir: ***"Haqqı buyurdu! O, Ucadır, Böyükdür!". (əs-Səba 23).***"[46]. Cabir - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Merac gecəsi Cəbrail – *əleyhissəlam* – ı gördüm. Rəbbinin qorxusundan köhnəlmiş döşəmə kimi idi"[47]. Ərəb sözü olan ***Hils* –** döşəmə, alta salma adlanır. ***"Göy gurultusu həmd edərək Ona tariflər deyir. Mələklər də Onun qorxusundan tariflər deyirlər". (ər-Rad 13).***

## Mələklər Allahın Ordularıdır

***«Rəbbinin ordularını özündən başqası bilməz. Bu insanlar üçün ancaq bir öyüd-nəsihətdir». (əl-Muddəssir 31).***

## Ərşi Daşıyan Mələklər

***"Mələklər isə onun ətrafında olacaqlar. O gün sənin Rəbbinin Ərşini səkkiz mələk daşıyacaqdır". (əl-Həqqa 17).***

## Dağlar Mələyi

---

[45] əl-Albani "Səhih Silsilə" 1/236, H. 477.

[46] Buxari 4701.

[47] Təbərani "Mucam əl-Avsat", əl-Albani "Səhihul Cəmi" 5864.

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in zövcəsi Aişə - *radıyallahu anhə* – rəvayət edir ki, Peyğəmbər– *sallallahu aleyhi və səlləm* – dən soruşdum: "Ey Allahın Elçisi, sənə Uhud günündən də daha şiddətli bir gün başına gəlibmi?" O , belə cavab verdi: "Sənin tayfandan nələr başıma gəldi, nələr. Onlardan ən şiddətli gördüyüm əziyyət əl-Aqabə günüdür. Özümü İbn Əbd Yəlil ibn Əbd Kulələyə ərz etmişdim. O mənim istədiyimə cavab vermədi. Mən kədərli üzlə (bir şəkildə) gözüm gördüyü yerə (qədər) çıxıb getdim. Yalnız Qarnu əs-Sələbə adlanan yerdə özümə gəldim. Başımı qaldırdığım vaxt bir buludun məni kölgələndirdiyini gördüm. Baxdığım zaman Cəbrail – *əleyhissəlam* – ı onun üzərində gördüm. Məni çağırıb: "Allah tayfanın sənə dediklərini və sənə cavab vermədiklərini (qəbul etmədiklərini) eşitdi. O sənə, onlara etmək istədiyini əmr etmən üçün onu, dağların mələyini göndərmişdir." deyə buyurdu. Dağların mələyi onu çağırdı və ona salam verdi. Sonra isə belə buyurdu: "Ey Muhəmməd, Allah tayfanın sənə dediyini eşitdi və mən, dağların mələyiyəm. Sənin Rəbbin məni sənə, onlara etmək istədiyini əmr etmən üçün göndərmişdir. Əgər istəyirsənsə, bu əl-Axşabeyni (iki dağı) onların üzərinə örtü kimi çəkim?" Peyğəmbər: "Yox! Allahdan diləyirəm ki, onların belindən yalnız Allaha ibadət edib, ona heç bir şeyi şərik qoşmayan kimsələr çıxarsın"[48].

## ***Bulud, Yağış, Təbiət Mələyi***

***"And olsun buyruqları yerinə yetirənlərə!". (ən-Nəziət 5). "And olsun işləri paylaşdıranlara!". (əz-Zəriət 4).*** İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Yəhudilər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gələrək dedilər: "Ey Əbul Qasım! Bizə ildırım haqqında xəbər ver, nədir o?". Peyğəmbər: «Bu Allahın buludları idarə etmək üçün müvəkkəl etdiyi bir mələkdir ki, əlindəki oddan olan ***Mixraqla (qamçı)*** – buludları dağıdaraq Allahın əmr etdiyi yerə aparır» deyə buyurdu. Onlar: «Bəs eşidilən gurultu nədir?» dedilər. Peyğəmbər: «Əmr edildiyi yerə apardığı zaman buluddan

[48] Buxari 3231, Müslim 1795.

çıxan səsidir» deyə buyurdu. Yəhudilər: "Doğru dedin" dedilər[49]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «(Bir gün) bir nəfər geniş və susuz bir səhrada gedərkən (qəflətən) buluddan: «Filankəsin bağçasını sula!» deyə bir səs eşitdi. Sonra bulud dərhal bağçaya tərəf yönələrək suyunu qara, daşlı bir sahəyə boşaltdı. Su isə bir yerə toplanaraq böyük kanal meydana gətirdi. O, kimsə suyu təqib edərək (suyun) axarı ilə getməyə başladı. Nəhayət (bir müddətdən sonra) öz bağçasının içərsində dayanmış bir kimsənin yanına çatdı. O, kimsə axan suyu kanallar vasitəsilə (istədiyi yerə) yönəldirdi. Ona: «Ey Allahın qulu! Adın nədir?» deyə soruşdu. O, da: «Filankəsdir!» dedi və buluddan eşitmiş olduğu adı (ona) söylədi. (Bağ sahibi): «Ey Allaın qulu! Nədən mənim adımı soruşursan?» dedi. O, da: «Mən bu suyu axıdan buludun içərisindən sənin adını verərək: «Filankəsin bağçasını sula!» deyə bir səs eşitdim. (Mənim üçün maraqlıdır) sən bu bağçada nə edirsən ki, (Allah sənə bu cür kəramət verib) dedi. (Bağ sahibi): «Madam ki, soruşursan onda mən sənə cavab verərəm» dedi. «Mən bu bağçadan çıxan məhsula baxır və (hesabat aparıram). Sonra çıxan məhsulun üçdə birini heç bir imkanı olmayan fəqirlərə, kasıblara verirəm. Üçdə birini özümə və ailəmə saxlayıram. Qalan üçdə birini isə torpağa (məhsul üçün) qaytarıram»[50]. ***"And olsun göylərdə və yerdə səf-səf duranlara, imansızları qətiyyətlə qovanlara. və Zikri oxuyanlara!". (əs-Saffət 1-3). "And olsun xeyirlə göndərilənlərə. və şiddətlə əsənlərə!And olsun Allahın əmrini yaydıqca yayanlara, haqqı nahaqdan ayırdıqca ayıranlara. və zikri çatdıranlara – üzr diləmək və ya qorxutmaq üçün çatdıranlara!". (əl-Mursələt 1-6).***

## Adəm Və Mələklər

Allah mələklərə Adəmi yaratdıqdan sonra onun qarşısında səcdə etmələrini əmr etdi. ***Bir zaman sənin Rəbbin mələklərə belə demişdi: "Mən palçıqdan bir insan yaradacağam. Mən ona surət***

---

[49] Tirmizi 3117, Əhməd "Musnəd" 2353.

[50] Müslim 2948.

***verib Öz ruhumdan üfürdüyüm zaman ona səcdə edin!". (Sad 71-72). "Mələklərin hamısı birlikdə səcdə etdi, yalnız İblisdən başqa! O təkəbbür göstərdi və kafirlərdən oldu". (Sad 73-74).***

## ***Mələklərin Öyüd-Nəsihəti***

Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: "Allah, Adəmi öz surətində boyu altmış dirsək uzunluğunda yaratdı. Sonra dedi: "Get orada oturan mələklərə salam ver və dinlə gör sənin salamını necə alacaqlar. Çünki bu həm sənin salamın, həm də sənin zürriyyətinin salamıdır". Adəm - *əleyhissəlam* - onlara: "Əs-Səlamu aleykum (sizə salam olsun)!"- dedi. Onlar da: "Əs-Səlamu aleykə və rahmətullah (sənə salam olsun və Allahın rəhməti yetişsin)!"- deyib buna: "və rahmətullah" kəlməsini əlavə etdilər. Cənnətə girəcək hər kəs (oraya) Adəm - *əleyhissəlam* - ın surətində girəcəkdir. İndiyə qədər də insanların xilqəti naqisləşməkdədir"[51].

## ***Mələklərin Adəm - Əleyhissəlam - ı Yumaları***

Adəm - *əleyhissəlam* - öldüyü zaman övladları onun cəsədi ilə nə etmələrini bilmirdilər. Mələklər onu yumağı öyrətdilər. Ubeyy – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: "Adəm - *əleyhissəlam* - öldüyü zaman mələklər onun cəsədini tək sayda su ilə yudular və onu dəfn etdilər. Bu da Adəm - *əleyhissəlam* - ın övladlarına olan sünnətidir"[52]. ***Həmçinin –*** mələklər Uhud günü şəhid olmuş Hənzələ İbn Amir – *radıyallahu anhu* – nun cəsədini də yumuşdular (qüsul) etmişdilər. Uhud günü döyüş çağırışını eşidən Hənzələ – *radıyallahu anhu* – evindən cünub olduğu halda qüsul etmədən çıxır və döyüşə gedir. Bu döyüşdə şəhid olur. Peyğəmbər: "Sizin yoldaşınızın cəsədini mələklər qüsul edirlər" deyə buyurdu[53].

## ***Mələklərin İnsanın Yaradılışında İştirakı***

---

[51] Buxari 6227, Müslim 2841.

[52] Təbərani "Mucəmul Vasit", əl-Albani "Səhihul Cəmi" 5207.

[53] Həkim 4917, Beyhəqi "Sünən" 4/15, əl-Albani "Səhih Silsilə" 1/581, 326.

Əbu AbdurRahmən Abdulla b. Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, doğru sözlü və doğru sözü təsdiq olunan Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Sizdən hər birinizin yaradılışı onun anasının bətnində qırx gün nütfə[54] şəklində olaraq bir yerə gətrilir. Sonra bu müddət ərzində aləqa[55] şəklində olur. Sonra yenə bu müddət ərzində mudğa[56] şəklində olur. Sonra ona bir mələk göndərilir, hansı ki, ona ruh üflədikdən sonra dörd xüsusiyəti yazmaqla əmr olunur. Ruzisini, əcəlini, əməlini, bədbəxt və ya xoşbəxt olacağını...»[57]. Ənəs b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah ana bətninə bir mələk (göndərər) və mələk: "Ya Rəbbim! Nütfə, Ya Rəbbim! Aləqa, Ya Rəbbim! Mudğa". Allah onu xəlq etmək istədikdə (Mələk): "Oğlan yoxsa qız, xoşbəxt yoxsa bədbəxt, Ruzisi nədir? Əcəli Nədir?". Bütün bunlar ana bətində ikən yazılır"[58]. Əbu Zərr - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Nütfənin (Ana bətinə) düşməsindən **42** gecə keçdikdən sonra Allah bir mələk göndərər. Mələk ona şəkil verərək: eşitmə, görmə, dəri və sümük (şəkilini) verər. Sonra: "Ya Rəbbim! Oğlan, yoxsa qız?" deyə soruşar. Bu zaman Allah öz iradəsini (qədərini) əmr edər və mələk də yazar"[59].

## ***<u>Mələklər Adəm Övladını Qoruyurlar</u>***

***«İnsan üçün onu öndən və arxadan təqib edən mələklər vardır. Onlar insanı Allahın əmri ilə qoruyurlar». (ər-Rəd 11).*** İbn Abbas - *radıyallahu anhu* – deyir ki: "Bu ayədə insanları öndən və arxadan qorumaq ilə mükəlləf olan mələklərdən danışılır. Lakin Allahın Qədəri ilə baş verəcək hadisə zamanı onu tərk edərlər". Mücahid – *rahmətullahi aleyhi* - deyir ki: "Hər bir qulun onu insanlardan,

---

[54] ***Nütfə*** – məni mənasındadır. Nütfə bəzən də saf su adlanır.

[55] ***Aləqa*** – laxtalanmış qan, ziyil deməkdir. ***O, insanı laxtalanmış qandan yaratdı***. *(əl-Ələq 2).*

[56] ***Mudğa*** – çeynənilmiş ət parçasına oxşadığı üçün ona bu ad verilmişdir.

[57] Buxari 3208, Müslim 2643.

[58] Buxari 6595, Fəthul Bəri 11/477, Müslim 2646.

[59] Müslim 2645.

cinlərdən və həşəratlarda gecə və gündüz qorumaq üçün mükəlləf olan mələyi vardır. Onlardan biri ona yaxınlaşdığı zaman mələk deyər: "Özünü qoru". Yalnız Allahın Qədəri ilə hadisə baş verəcəksə bu hallardan başqa". ***"O Öz qulları üzərində mütləq hakimiyyət sahibidir. O sizə gözətçi mələklər göndərir. Nəhayət sizlərdən birinə ölüm gəldiyi zaman elçilərimiz (mələklər) onun canını alırlar və heç bir səhvə yol vermirlər". (əl-Ənam 61).***

## ***Peyğəmbər – Sallallahu Aleyhi Və Səlləm – Vəhyi Necə Alırdı***

***«Yoxdan yaradan Rəbbinin adı ilə oxu! O, insanı laxtalanmış qandan yaratdı. Oxu! sənin Rəbbin ən böyük kərəm sahibidir. O Rəbbin ki, insana qələmlə (yazmağı) öyrətdi. O rəbbin ki, insana bilmədiklərini öyrətdi». (əl-Ələq 1-5).*** Vəhy Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə bir neçə şəkildə gəlirdi. Aişə - *radıyallahu anhə* – rəvayət edir ki, bir gün Xaris b. Hişam - *radıyallahu anhu* – Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən: «Ya Rəsulullah! Vəhy sənə necə gəlir?» deyə soruşdu. Peyğəmbər: «Hərdən vəhy zınqırov səsi kimi gəlir. Bu da mənim üçün (vəhyin) ən ağır gəliş şəklidir. Deyilənləri öyrəndikdən sonra o, məni tərk edir. Hərdən də mələk mənim qarşıma insan qiyafəsində gəlir və vəhyi mənə çatdırır. Mən də onun dediklərini yadda saxlayıram. Aişə - *radıyallahu anhə* – deyir ki, mən görürdüm necə ki, soyuq bir havada vəhyin gəlişindən sonra onun alnından tər axardı»[60]. Cabir İbn Abdullah əl-Ənsari - *radıyallahu anhu* – vəhyin (müvəqqəti olaraq) kəsilməsindən danışarkən rəvayətində bunu da söyləmişdir. Peyğəmbər: "(Bir dəfə) mən yol gedərkən göydən səs eşitdim və başımı yuxarı qaldırdım. Bir də gördüm ki, Hira dağında yanıma gələn mələk göylə yer arasında olan kürsünün üzərində əyləşmişdir. Mən ondan qorxdum. (Evə) qayıdıb "Üstümü örtün, üstümü örtün!"– dedim. Uca Allah da: ***"Ey əbasına bürünüb örtünmüş peyğəmbər! Qalx və insanları xəbərdar***

---

[60] Buxari 2.

***et! Təkcə Rəbbini uca tut! Geyimini təmiz saxla! Pis şeyləri tərk et!". (əl-Mudəssir 1-5).*** Ayələrini nazil etdi. Sonra vəhy çoxaldı və bir-birinin ardınca nazil olmağa başladı[61].

## *Cəbrail - Əleyhissəlam – Vəhyi Nazil Edəndir*

Uca və Böyük olan Allah bu vəzifənin icrasını Cəbrail - *əleyhissəlam* - ın üzərinə qoymuşdur. ***"De: "Cəbrailə düşmən olan kəs bilsin ki, Allahın izni ilə Quranı özündən əvvəlkiləri təsdiqləyən, möminlərə doğru yol göstərən və müjdə verən bir kitab kimi sənin qəlbinə o nazil etmişdir". (əl-Bəqərə 97). "Onu sadiq Ruh (Cəbrail) endirdi. Sənin qəlbinə ki, xəbərdar edənlərdən olasan". (əş-Şuəra 193-194).***

Lakin bəzən digər mələklər də bu vəzifəni icra edirdilər. Abdullah İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir: "Cəbrail - *əleyhissəlam* - Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanında oturan zaman Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – yuxarıdan qapı səsinə oxşar bir səs eşitdi və başını qaldırdı. (Cəbrail) dedi: "Bu, göydə olan bir qapıdır. Bundan əvvəl heç vaxt açılmayıb, yalnız bu gün açıldı. Oradan bir mələk endi. (Cəbrail) dedi: "Bu Yer üzünə enən bir mələkdir. Bu günə qədər Yer üzərinə heç enməmişdir". Mələk salam verdi və dedi: "Sənə verilən iki nur ilə müjdələn! Bu iki nur səndən əvvəl heç bir peyğəmbərə verilmədi. Bu iki nur, Kitabı açan "əl-Fatihə" surəsi və "əl-Bəqərə" surəsinin son ayələridir. Onlardan oxuyacağın hər bir hərfə görə sənə (savab, istədiyin) veriləcəkdir!"[62]. Huzeyfə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Mənim yanıma mələk nazil olub məni salamladı. Mələk mənə mühüm bir xəbəri çatdırmaq üçün səmadan ilk dəfə idi (yer üzünə) nazil olurdu və o: "Həsən və Hüseyn - *radıyallahu anhum* – Cənnət cavanlarının seyyidi, Fatimə - *radıyallahu anhə* – isə Cənnət qadınlarının seyyididir"[63].

---

[61] Buxari 4.

[62] Müslim 806, 1913.

[63] İbn Əsakir "Tarix", Əhməd "Musnəd" 5/391, Tirmizi 3781, əl-Albani "Səhih Cəmi" 79.

## ***Cəbrail - Əleyhissəlam – In Vəzifəsi Tək Vəhyi Çatdırmaqla Bitmirdi***

İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir: "Allahın elçisi – *sallallahu aleyhi və səlləm* – insanların ən səxavətlisi idi. Ramazan ayında, Cəbrail - *əleyhissəlam* - ilə görüşdüyü zaman isə daha səxavətli olardı. Cəbrail - *əleyhissəlam* - Ramazan ayının hər gecəsində Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ilə görüşər, onunla birgə Quranı oxuyub təkrar edərdi. Odur ki, (bu günlərdə) Allahın elçisi – *sallallahu aleyhi və səlləm* – xeyirxah işlər görməkdə sərbəst əsən küləkdən daha comərd olardı"[64].

## ***Cəbrail - Əleyhissəlam - Peyğəmbər – Sallallahu Aleyhi Və Səlləm – Ə Namazı Öyrədir***

Məlumdur ki, Cəbrail - *əleyhissəlam* - Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə Allahın buyurduğu şəkidə namaz qılmağı öyrədir. Rəvayət edilir ki, bir gün Muğira ibn Şobə - *radıyallahu anhu* – İraqda ikən (əsr) namazını (başlanğıc vaxtından bir qədər) gec qıldı. (Bunu görən Əbu Məsud əl-Ənsari - *radıyallahu anhu* – onun yanına gəlib) dedi: "Bu nədir, ey Muğira? Məgər sən bilmirsən ki, Cəbrail - *əleyhissəlam* - yerə enib namaz qıldı[65], Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – də o namazı qıldı; sonra yenə namaz qıldı, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – də o namazı qıldı; sonra yenə namaz qıldı, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – də o namazı qıldı; sonra yenə namaz qıldı, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – də o namazı qıldı; sonra yenə namaz qıldı, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – də o namazı qıldı[66] və dedi: "Mənə belə əmr edildi". [67]

---

[64] Buxari 6.

[65] Merac gecəsi Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə beş vaxt namaz qılmaq vacib buyrulduqdan sonra o geriyə dönmüş, ertəsi gün də Cəbrail - *əleyhissəlam* - yerə enib ona namaz vaxtlarını öyrətmişdir.

[66] Burada zöhr, əsr, məğrib, işa və fəcr namazları qəsd edilir.

[67] Buxari 521.

## ***Cəbrail - Əleyhissəlam – In Peyğəmbər – Sallallahu Aleyhi Və Səlləm – Ə Ruqyə Oxuması***

Əbu Səid - *radıyallahu anhu* – rəvayət edir ki, Cəbrail - *əleyhissəlam* - Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gələrək dedi: "Ey Muhəmməd! Xəstələndinmi?". O: "Bəli" dyə buyurdu: "Cəbrail: "Allahın adı ilə, sənə əziyyət verən hə bir şeydən sənə oxuyuram (dua edirəm), hər bir (şərli) nəfsdən, hər bir həsəd aparanın nəzərindən, Allah sənə şəfa versin! Allahın adı ilə sənə Ruqyə oxuyram"[68]. Aişə - *radıyallahu anhə* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – xəstələndiyi zaman Cəbrail - *əleyhissəlam* - ruqyə oxuyaraq deyərdi: "Hər bir xəstəlikdən sənə şəfa verən, həsəd aparanın həsədinin şərrindən və hər bir (gözü) nəzəri dəyənin şərrindən əmin (qoruyan) Allahın İsmi ilə"[69]. ***Həmçinin*** **–** Cəbrail - *əleyhissəlam* - Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ilə bərabər Bədr və Xəndək döyüşündə də iştirak etmiş, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – İsra və Merac gecəsi müşayiət etmişdir.

## ***Mələyin Nazil Olduğu Hər Bir Kəs Peyğəmbər Sayılırmı?***

Düşünmək ki, mələyin nazil olduğu hər bir kəs Peyğəmbərdir, bu düzgün deyildir. Məlumdur ki, Allah mələkləri bir çox insanlara göndərmişdir. Kimisinə Allahın vəhyini çatdırmaq, kimisini imtahan etmək üçün göndərmişdir. Məs: Allah Cəbrail - *əleyhissəlam* – ı Məryəmin yanına göndərmiş, Həcər və İsmail - *əleyhissəlam* – ın yanına yemək və içməkləri qurtardığı zaman göndərmiş, ***həmçinin*** - səhabələr də Cəbrail - *əleyhissəlam* – ı insan surətində Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə vəhyi nazil edərkən görmüşlər, ***həmçinin*** -hədilərdən məlumdur ki, Allah İsrail övladlarından olan üç insanı imtahan etmək üçün – Keçəl, kor və cüzəm xəstəsini – mələk göndərmiş, ***həmçinin*** - öz xəstə

---

[68] Muxtəsər Müslim 1444, İbn Məcə 3524, əl-Albani "Səhihdə" 2060.

[69] Muxtəsər Müslim 1443, İbn Məcə 3523.

qardaşını Allah üçün ziyarət etməyə gedən kimsəni imtahan üçün mələk göndərmişdir. Bütün bunlar irəlidə hədislərlə qeyd ediləcəkdir.

## *Nə Üçün Peyğəmbərlər Mələklərdən Olmayıb?*

Uca və Böyük olan Allah bəşəriyətə mələklərdən elçilər göndərməyib. Çünki onların yaradılış xilqəti insanların yaradılışından fərqlidir və insanlara mələkləri öz surətində görmək çox ağır olardı. Peyğəmbər – *sallallahu aleyhi və salləm* – Cəbail - *əleyhissəlam* – ı öz yaradılış xilqətində gördükdə bu ona çox ağır olmuşdur. İlk vəhy olunan ayələrdən sonra Peyğəmbər – *sallallahu aleyhi və salləm* – qəlbində bir qorxu (titrəmə) olaraq evə Xədicə b. Xuveylid - *radıyallahu anhə* – nin yanına qayıtdı. Dərhal: «Məni örtüb bürüyün! Məni örtüb bürüyün!» deyə buyurdu. Onu örtdülər. Qorxu ondan gedənə qədər o, bu vəziyyətdə qaldı. (Qorxu ondan getdikdən sonra) Peyğəmbər – *sallallahu aleyhi və salləm* – Xədicə - *radıyallahu anhə* – ə: «Ey Xədicə! Mənə nə olur?» deyə buyurdu və baş vermiş şeyləri ona xəbər verdi. Peyğəmbər: «Özüm-özümdən (nəfsimdən) qorxdum!» deyə buyurdu[70]. Buna görə də Allah Adəm övladlarının özlərindən elçi göndərdi. ***“De: "Əgər yer üzündə arxayın gəzib dolaşanlar mələklər olsaydı, albəttə, onlara göydən bir mələk elçi göndərərdik". (əl-İsra 95).*** Hətta Uca və Böyük olan Allah bəşəriyətə mələk göndərsəydi onu insan surətində göndərərdi. ***“Onlar: "Nə üçün ona mələk endirilməyib?"– dedilər. Əgər biz mələk endirsəydik, iş bitmiş olardı, onlara isə möhlət verilməzdi. Əgər biz onu mələk etsəydik, əlbəttə, onu kişi edərdik və onları bir daha düşdükləri şübhəyə salardıq". (əl-Ənam 8-9).*** Lakin kafir elə kafirdir. Hətta onlara mələklər də elçi olaraq gəlsəydi Allah istəmədikcə onlar iman etməzdilər. ***“Əgər Biz onlara mələkləri göndərsəydik, ölülər də onlarla danışsaydı və hər şeyi onların qarşısına toplasaydıq, Allah istəməyincə, onlar iman gətirməzdilər. Lakin onların çoxu bunu bilmir". (əl-Ənam 111).*** *Allah daha doğru bilir!*

---

[70] Buxari 3-5, Müslim 160.

## ***Mələklər Adəm Övladının Yaxşı Və Pis Əməllərini Qeyd Edirlər***

Kiramə və Kətibin mələkləri - Allah onları üzərimizə əməllərimizi, sözlərimizi və davranışımızı yazmaq üçün mükəlləf edib. Bizi ancaq ayaq yoluna girdiyimiz və cima halında tək buraxarlar. ***«Sizin üstünüzdə gözətçi mələklər (əməllərinizi) yazan və (Allah dərgahında) çox hörmətli mələklər vardır. Onlar sizin nə etdiklərinizi bilirlər». (əl-İnfitar 10-12). «Şübhəsiz ki, elçilərimiz qurduğunuz hiylələri (əməl dəftərinizə) yazırlar». (Yunus 21). «Yoxsa onlar elə güman edirlər ki, biz onların pıçıltılarını və xəlvəti danışıqlarını eşitmirik! Xeyr, yanlarında olan elçilərimiz yazırlar». (əz-Zuxruf 80). «İnsan üçün onu öndən və arxadan təqib edən mələklər vardır. Onlar insanı Allahın əmri ilə qoruyurlar». (ər-Rəd 11).*** İbn Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Çılpaq olmaqdan çəkinin. Sizinlə birlikdə ayaq yoluna girdiyiniz vaxt ilə cima halından başqa sizdən ayrılmayan mələklər vardır. Onlardan həya edin və onlara ikramınız olsun»[71]. ***"Dediyi elə bir söz yoxdur ki, onu yazmaq üçün yanında hazır durmuş gözətçi olmasın". (Qaf 18).*** Ayə açıq-aydın dəlildir ki, mələklər insanın söylədiyi və etdiyi heç bir söz və əməli nəzərdən qaçırmadan qeyd edirlər. Buna görə də insan Qiyamət günü əməl kitabında bütün etdikləri əməlləri gördükdə: ***"Hər kəsin kitabı qarşısına qoyulacaq və sən günahkarların orada yazılmış olanlardan qorxduqlarını görəcəksən. Onlar deyəcəklər: "Vay halımıza! Bu necə bir kitab imiş! O nə bir kiçik, nə də bir böyük günahı buraxmadan hamısını sayıb yazmışdır!" Onlar etdikləri əməlləri öz qarşılarında görəcəklər. Rəbbin heç kəsə haqsızlıq etməz!". (əl-Kəhf 49).*** İbn Kəsir – *rahmətullahi aleyhi* - ayənin təfsirində Həsənul Bəsri – *rahmətullahi aleyhi* – nin belə dediyini rəvayət edir: "Ey Adəm övladı! Sənin qarşında kitabındır. Sağ və Sol tərəfində iki

---

[71] Tirmizi 2800, əl-Albani «Zəif».

möhtərəm mələk vardır. Sağ tərəfində olan mələk yaxşı əməllərini, sol tərəfində olan isə pis əməllərini yazmaqla mükəlləfdir. Nə istəyirsənsə - az və ya çox et! Öldüyün zaman kitabın bükülüb boynundan asılacaqdır. Boynunda Qiyamət günü qəbrindən həşr olana kimi qalacaqdır. "***Biz hər bir insanın əməlini öz boynundan asdıq. Qiyamət günü isə açıq vəziyyətdə qarşısına qoyulan kitabı ona göstərəcəyik. Kitabını oxu! Bu gün sənə özün-özünü hesaba çəkməyin yetər". (əl-İsra 13-14).*** Allaha and olsun! Ədalətli qərar vermişdir səni özün-özünü hesaba çəkməyə izin verən". İbn Kəsir – *rahmətullahi aleyhi* - deyir ki: "İmam Əhməd – *rahmətullahi aleyhi* - xəstəlyi zamanı ah çəkirdi. Ona Tavusun – *rahmətullahi aleyhi* - sözlərini deyirlər: "Allahın (mələkləri) hətta "Ah" çəkməyi belə qeyd edirlər" dedilər. Bundan sonar ölən günə kimi bir daha Ah çəkmədi". ***"Dediyi elə bir söz yoxdur ki, onu yazmaq üçün yanında hazır durmuş gözətçi olmasın". (Qaf 18).*** İbn Abbas - *radıyallahu anhu* – ayənin təfsirində deyir ki: "Söylədiyi bütün yaxşı və pis əməllər qeyd edilir, hətta: "Mən içdim" – "Mən yedim" – "Mən getdim" – "Mən gördüm" – sözləridə. Hər (həftənin) dördüncü günü onun əməlləri Allaha ərz olunar. Yaxşı və pis əməllərdən başqa bütün əməl və (sözləri) atılar. ***"Allah bu yazıdan istədiyini silər, istədiyini də sabit saxlayar. Kitabın anası da Onun yanındadır". (ər-Rəd 39).*** Əbu Umamə - *radıyallahu anhə* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sol kitab sahibi öz qələmini günah etmiş müsəlmandan altı saat müddətinə qaldırar. Əgər o, tövbə edib bağışlanma diləyərsə etdiyi günah yazılmaz. Əksi təqdirdə onu bir günah olaraq qeyd edər»[72].

## *Mələklər Adəm Övladlarını Yaxşı İşlər Görməyə Yönəldirlər*

Allah hər bir insanın üzərinə bir mələk və bir şeytan qoymuşdur. Onlar ölənə kimi onunla bərabərdirlər. Onlardan biri daima onu pis işlər görməyi vəsvəsə edər və ona yönəldər, digəri

[72] Təbərani «əl-Kəbir», Beyhəqi «Şiab əl-İman», əl-Albani «Səhih Silsilə» 1209, "Səhih Cəmi" 2/212, 2097.

isə yaxşı işləri əmr edər və ona həvəsləndirər. İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və sælləm* – buyurdu: "Sizdən hər birinizin üzərində cinlərdən və mələklərdən bir nəzarətçi vardır". İnsanlar: "Hətta sənində Ya Rəsulullah!" dedilər. O: "Bəli, hətta mənimdə. Lakin Allah mənə ona qalib gəlməkdə yardım etmişdir. Artıq (cinn) mənə xeyirdən başqa bir şey əmr etməz"[73]. Cabir - *radıyallahu anhu* – deyir ki: "İnsan evinə və ya yatağına girdiyi zaman bir mələk və bir şeytan tələsik ona tərəf gələr. Mələk deyər: "(Gününü) xeyir ilə bitir!" Şeytan deyər: "(Gününü) şər ilə bitir!" Əgər Allaha həmd edib onu yad etsə, şeytanı qovar və bütün gecəni mələk onu qoruyar. Yuxudan oyandıqda da bir mələk və bir şeytan tələsik ona tərəf gəlib həmin sözləri deyər. Əgər Allahı yad edib: "Canımı aldıqdan sonra özümə qaytaran, yuxuda ikən onu öldürməyən Allaha həmd olsun!", Həmd olsun Allaha! O Allah ki: ***"Göyləri və yeri öz oxundan çıxmasınlar deyə, tutub saxlayır. Əgər öz oxundan çıxsalar, Ondan başqa onları heç kəs tutub saxlaya bilməz. Həqiqətən də O, Həlimdir, Bağışlayandır!". (Fatir 41).*** Həmd olsun Allaha! O Allah ki: ***"Onun izni olmadan yerə düşməsin deyə göyü tutub saxladığını görmürsənmi? Həqiqətən, Allah insanlara Şəfqətlidir, Mərhəmətlidir!". (əl-Həcc 65).*** desə, sonra da ölsə şəhid kimi ölər və əgər bunu deyib namaz qılsa, fəzilətlər içində namaz qılmış olar"[74]. İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və sælləm* – buyurdu: "İnsan oğluna şeytanın Ləmməsi (vəsvəsə) və mələyin Ləmməsi (ilham) etməyi vardır. Şeytanın vəsvəsəsi pisliklərə aparmaq və haqqı yalanlamaqdır, Mələyin ilham etməsi xeyirlərə yönəltmək və haqqı doğrulamaqdır. Kim xeyirlərə yönəlməyi və haqqı doğrulamağı köksündə taparsa Allahdan olduğunu bilsin və Allaha həmd etsin, kim də könlündə şeytanın vəsvəsəsini taparsa lənətlənmiş şeytandan Allaha sığınsın. Sonra Peyğəmbər: ***"Şeytan sizi***

---

[73] Müslim 2814.

[74] İbn Hibban 5533, Həkim 1/448, əl-Albani "Zəif Ədəbul Mufrad" 1214.

***yoxsulluqla qorxudur və yaramaz işlər görməyi əmr edir. Allah isə sizə Öz tərəfindən bağışlanma və mərhəmət olunacağını vəd edir. Allah hər şeyi Əhataedəndir, Biləndir". (əl-Bəqərə 268)*** ayəsini oxudu[75]. Sələflər deyirlər ki: «İnsan sabahladıqda ona tərəf şeytan və mələk tələsərək gələr. Əgər bəndə Allahı zikr edər, Təsbih, Təhlil edərsə mələk şeytanı qovar və bəndəni özünə dost tutar. Əgər insan başqa şeylərlə sabahlayarsa mələk ondan uzaqlaşar və şeytan onu özünə dost tutar».

## ***Mələklər Qəlbdə Olanı Da Qeyd Edirlərmi?***

İmam ət-Tahavi – *rahmətullahi aleyhi* - "Şərh Əqidətul Təhaviyyə" səh: 388 deyir ki: "Mələklər insanın qəlbində baş verənləri də qeyd edirlər. ***"Onlar sizin nə etdiklərinizi bilirlər". (əl-İnfitar 12).*** Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Mələklər: "Ya Rəbb! Filan qulun bir pislik etmək istər" deyərlər. Allah: "Hər bir şeyi gözəl bildiyi (gördüyü) halda (mələklərə): "Onu bir izləyin, əgər edərsə misli qədər (günah) qeyd edin. Etməzsə bunu ona bir həsənə olaraq qeyd edin. Çünki qulum o, pisliyi yalnız Mənim rızam üçün tərk etmişdir" deyə buyurdu[76]. Əbu Hureyra - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Qulum günah iş görmək istəsə, o günahı edənədək bunu onun əleyhinə yazmayın. Əgər o günah etsə, ancaq onun mislində günah yazın, yox, əgər Məndən qorxaraq bu işdən əl çəkərsə, ona bir savab yazın. Və əgər bir yaxşılıq etmək istəsə və onu yerinə yetirməsə, buna görə ona bir savab yazın, əgər onu yerinə yetirərsə, ona bunun on mislindən yeddi yüz qatınadək savab yazın"[77].

Kimdəsə sual yarana bilər ki: Necə ola bilər mələklər insanın qəlbini və niyyətini bilirlər. Məgər bu Allaha xas olan bir şey deyil? Bəli, insanlar arasında bu belədir. Məşər övladından heç kəs

---

[75] Tirmizi 2988, əl-Albani "Zəif".
[76] Müslim 205, 352, Əhməd 8203, 8219.
[77] Buxari 7501, 7062.

qardaşının qəlbində olanları bilə bilməz. Lakin bu o, demək deyil ki, Allah bu biliyi mələklərinə verməyib. Yuxarıda qeyd etdiyimiz dəlillər buna açıq-aydın sübutdur. Demək olar ki, mələklər insanların niyyət və arzularını bilirlər. Lakin insanın etiqadını və digər qəlbində olan şeyləri bilməsi barəsində bizdə heç bir dəlil yoxdur. *Allah daha doğru bilir!*

## ***Mələklər Allah Yolunda Sərf Edənlər Üçün Dua Edirlər***

Peyğəmbər– *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər səhər yer üzünə iki mələk enir və Allaha dua edərək deyirlər: "***Allahummə Əatı Munfiqan -*** Allahım, malını (Sənin yolunda) xərcləyən hər kəsə (etdiyi yaxşılığın) əvəzini ver!"– deyir. Digəri isə: "Allahım, (malını xərcləməkdə) xəsislik edən hər kəsin (malını) tələf et!"– deyir[78].

## **əə ə ə Ö ı ı İ ə**

Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah İsrail oğullarından cüzəm xəstəliyinə tutulanı, keçəli və koru imtahan etmək üçün yanlarına bir mələk göndərir. Mələk cüzəm xəstəliyinə tutulanınn yanına gələrək: «Ən çox nəyi arzu edirsən?» deyə soruşur. Cüzəm: «Gözəl rəng, gözəl dəri və insanları məndən iyrəndirərək uzaqlaşdıran bu xəstəliyin getməsini arzu edirəm!» dedi. Mələk cüzəmin vücuduna əl sürtdü. Dərhal ondan bu xəstəlik getdi və ona gözəl rənglə, gözəl dəri verildi. Mələk: «Ən çox sevdiyin mal hansıdır?» dedi. Cüzəm: «Dəvə və ya inək!» deyə cavab verdi. Ona on aylıq bir dəvə verildi. Mələk: «Allah bunu sənin üçün bərəkətli etsin!» deyə dua etdi. Sonra mələk keçəlin yanına gələrək: «Ən çox nəyi arzu edirsən?» deyə soruşur. Keçəl: «Gözəl saç və insanları diksindirərək məndən uzaqlaşdıran bu keçəlliyin getməsini arzu edirəm!» deyə cavab verdi. Mələk onun da vücuduna əl sürtdü. Dərhal keçəllik ondan gedərək yerinə gözəl saç verildi. Mələk: «Ən

[78] Buxari 1374, 1442, Müslim 1010, 2383, İbn Hibban 3329.

çox sevdiyin mal hansıdır?» dedi. Keçəl: «İnək!» deyə cavab verdi. Ona da balalı bir inək verildi. Mələk: «Allah bunu sənin üçün bərəkətli etsin!» deyə dua etdi. Sonra mələk korun yanına gələrək: «Sən ən çox nəyi arzulayırsan?» deyə soruşur. Kor: «Allahdan gözlərimi geri qaytarmasını və insanları görməyimi arzu edirəm!» deyə cavab verdi. Mələk ona da əl sürtdü və Allah ona görmə qabiliyyətini verdi. Mələk: «Ən çox sevdiyin mal hansıdır?» dedi. Kor: «Qoyun!» deyə cavab verdi. Ona da balalı qoyun verildi.

Bir müddətdən sonra dəvə və mal-qara sahiblərinin heyvanları bala verdilər. Qoyun sahibinin də qoyunu quzuladı. O, qədər ki, dəvə sahiblə-rinin bir vadi dəvəsi, mal-qara sahibinin bir vadi mal-qarası, qoyun sahibinin də bir vadi dolusu qoyunları oldu. Günlərin birində mələk bu üç kimsə ilə görüşmək üçün ilk görüşdüyü surətdə cüzəmin yanına gəldi və ona: «Mən kasıb birisiyəm. Səfər zamanı bütün azuqəmdən məhrum olmuşam. Bu günki gündə Allahdan, sonra da səndən başqa müraciət edəcəyim yer yoxdur. Sənə gözəl rəng, gözəl dəri və gözəl mal verən Allah xatirinə səndən bu səfərimi bitirib (yurduma) çatmaq üçün dəvə istəyirəm. Cüzəm: «Borcum çoxdur və (sənə verəcəyim malım da yoxdur)» dedi. Mələk: «Mən səni tanıyıram. Sən insanların iyrənərək çəkindiyi və Allahın var-dövlət verdiyi kasıb deyilsən?» dedi. Cüzəm: «Xeyr, mənə bu mal-qara ata babamdan mülk qalıb!» deyə cavab verdi. Mələk: «Əgər sən yalan deyirsənsə qoy Allah səni əvvəlki vəziyyətinə qaytarsın!» dedi. Sonra mələk keçəlin yanına gəldiyi ilk görkəmdə gələrək ona da cüzəmə dediyi sözlərin eynisini dedi. Keçəl də cüzəmin verdiyi cavabın eynisini vedi. Mələk ona da bəd dua edərək: «Qoy Allah səni də əvvəlki vəziyyətinə qaytarsın?» dedi. Mələk bundan əvvəlki surətdə gəldiyi kimi korun da yanına gələrək ona da: «Mən kasıb birisiyəm. Səfər zamanı bütün azuqəmdən məhrum olmuşam. Bu günki gündə Allahdan, sonra səndən başqa müraciət edəcəyim yer yoxdur. Sənə gözünü qaytaran Allah and verirəm səndən bu səfərimi bitirib (yurduma) çatmaq üçün qoyun istəyirəm». Kor: «İstədiyin qədər götür və istədiyin qədər də saxla. Həqiqətən mən

kor bir kimsə idim. Allah mənə gözlərimin nurunu verdi. Vallahi bu gün Allah üçün alacağın (götürəcəyin) heç bir şeydə sənə əngəl olmayacağam və götürdüklərini geri qaytarılmasını da istəmirəm!» deyə cavab verdi. Mələk: «Malını saxla özünə. Allah sizləri imtahan etdi və səndən də razı qaldı. O, iki yoldaşına isə qəzəb etdi» deyə cavab verdi[79]. Əbu Hureyra – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Bir kişi (başqa) bir kənddə olan qardaşını ziyarət etdi. Allah onun keçəcəyi yolunun üstünə bir mələyi gözətçi göndərdi. Mələk (ona) dedi: "Hara getmək istəyirsən?" O dedi: "Bu kənddə olan qardaşımı ziyarət etmək istəyirəm". (Mələk) dedi: "Onun sənə verəcəyi bir mənfəət varmı?" O dedi: "Xeyr! Mən onu (mənfəətə görə deyil) Allah xatirinə sevirəm". (Mələk) dedi: "Mən Allahın sənə göndərdiyi elçisiyəm. Sən onu sevdiyin kimi Allah da səni sevdi"[80].

## ***<u>Mələklər Adəm Övladının Canını Alırlar</u>***

***De: "Sizə müvəkkil olan ölüm mələyi canınızı alacaq, sonra da Rəbbinizə qaytarılacaqsınız!". (əs-Səcdə 11). "O Öz qulları üzərində mütləq hakimiyyət sahibidir. O sizə gözətçi mələklər göndərir. Nəhayət sizlərdən birinə ölüm gəldiyi zaman elçilərimiz (mələklər) onun canını alırlar və heç bir səhvə yol vermirlər. Sonra onlar özlərinin həqiqi Himayədarı olan Allaha qaytarılacaqlar. Hökm yalnız Ona məxsusdur və O, ən tez haqq-hesab çəkəndir". (əl-Ənam 61-62).*** Davud - *əleyhissəlam* - şiddətli bir həyacan içində idi. Çıxdığı zaman (evin) bütün qapılarını bağlayardı. O, gəlincə evinə heç kimsə girməzdi. Bir gün yenə də evindən çıxar qayıtdığı zaman evində bir nəfəri görür. Davud: "Sən kimsən?" dedi. O: "Mən elə bir kimsəyəm ki, padşahlardan qorxmaram, manelər girməyimə mane olmaz". Davud: "Elə isə sən Ölüm mələyisən. Allahın əmri ilə gəlmisən. Libasına büründü və həmən ruhu alındı"[81]. Hüseyn - *radıyallahu anhu* – rəvayət edir ki: "Cəbrail -

---

[79] Buxari 3464, Müslim 2964.
[80] Buxari "Ədəbul Mufrad" 350, əl-Albani "Səhih".
[81] İmam Cəlaləddin əs-Suyuti "Qəbir Aləmi".

*əleyhissəlam* - Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ın vəfat etdiyi günü yanına gəlir. Ona: “Özünü necə hiss edirsən?” dedi. Peyğəmbər: “Ey Cəbrail! Çox sıxıntı və qəmdəyəm” deyə buyurdu. Bu an ölüm mələyi qapıda girmək üçün izn istədi”. Cəbrail: “Ey Muhəmməd! Bu ölüm mələyidir. Yanına girmək üçün izn istəyir. Səndən öncə heç bir Adəm oğlundan izn istəmədiyi kimi səndən sonra da heç kimsədən izn istəməyəcəkdir”. Peyğəmbər: “Ona izn ver” dedi. O, da izn verdi. Ölüm mələyi onun önündə ehtiramnan oturdu və: “Allah məni sənə göndərdi, sənə itaət etməyimi əmr etdi. Əgər buyursan ruhunu alacağam, yox – tərk edəcəyəm” dedi. Peyğəmbər: “(Əmr olunduğunu edəcəksən) Ey ölüm mələyi?” deyə soruşdu. O: “Bəli” dedi. Peyğəmbər: “Elə isə əmr olunduğunu et!” deyə buyurdu. Cəbrail: “Allah səni öz yanına almaq istəyir” dedi. Peyğəmbər: “Əmr olunduğunu et, ey Mələk” deyə buyurdu[82]. Rəvayətlərdə gəlir ki, Peyğəmbər - *səllallahu aleyhi və səlləm* – Cəbrail – *əleyhissəlam* – dan soruşur ki: «Nə olub ki, mən Mikail – *əleyhissəlam* – ı heç vaxt gülən görmürəm». O: «Cəhənnəm yaradılandan bəri o, heç vaxt gülməyib»[83]. Ölüm mələyi İbrahim - *əleyhissəlam* - ın ruhunu almaq üçün gəlmişdir. İbrahim: “Ey Mələkul Movt! Heç dost dostun canını alarmı?”. Ölüm mələyi Rəbbinə dönərək Allah ona buyurdu: İbrahim - *əleyhissəlam* - de: Heç dost dosta qovuşmaqdan çəkinərmi?”. Mələk bunu İbrahim - *əleyhissəlam* - xəbər verincə İbrahim: “Canımı al!” dedi[84].

## ***Mələklər Adəm Övladının Cənnətə Düşməsi Üçün Səyy Göstərərlər***

Əbu Səid Sad b. Məlik b. Sinan əl-Xudri – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Sizdən əvvəlki ümmətlərdə doxsan doqquz insan oldürmüş bir kimsə var idi. Bu kimsə (öldürdükdən) sonra yer üzünün ən alim insanını axtarmağa başlayır. Ona (İsrail oğullarından) bir rahibi

---

[82] Təbərani, İmam Cəlaləddin əs-Suyuti “Qəbir Aləmi”.
[83] İmam Əhməd “Musnəd”.
[84] İmam Əhməd, İmam Cəlaləddin əs-Suyuti “Qəbir Aləmi”.

göstərirlər. O, rahibin yanına gələrək: «Mən doxsan doqquz insan öldürmüşəm və tövbə etməyin mənə faydası olacaqmı?» deyə soruşdu. Rahib: «Xeyr!» deyə cavab verincə onu da öldürür. Beləcə (öldürdüyü insanların sayını) yüzə çatdırır. Sonra yenə də yer üzünün ən alim insanını axtarmağa başlayır. Ona bir nəfər elmli insanı göstərirlər. Alimin yanına gələrək yüz nəfər öldürdüyünü və tövbə etməyin ona fayda verəcəyi haqqında soruşur. Alim: «Bəli! Tövbə edən insana kim mane ola bilər! Sən filan yerə get! Çünkü orada Allaha ibadət edən bir tayfa vardır. Onlarla birlikdə Allaha ibadət et və bir daha bu məmləkətə qayıtma. Çünkü bura çox pis yerdir! Bu (söhbətdən) sonra adam alimin dediyi yerə yollanır. Lakin yolun yarsına çatdıqda ölüm onu yaxalayır. Bu kimsəyə görə Rəhmət mələkləri ilə əzab mələkləri bir-birləri ilə mübahisəyə başlayırlar. Rəhmət mələkləri: «Bu adam tövbə edərək və qəlbini Allaha yönəldərək gəldi!» deyirlər. Əzab mələkləri: «Bu adam bu günə qədər heç bir xeyir işləməmişdir!» deyirlər. Bu an insan qiyafəsində bir mələk onların yanına gəlir və hər iki tərəf onu öz aralarında hakim təyin edirlər. O, deyir: «Gəldiyi yer ilə gedəcəyi yeri ölçün! Hansı tərəf daha yaxın olarsa ora aiddir!» Mələklər hər iki tərəfi ölçürlər və adamın getdiyi yerə yaxın olduğunu görürlər və Rəhmət mələkləri onun ruhunu alıb gedirlər (aparırlar)». Başqa rəvayətdə: «Uca Allah günahkarların yaşadığı yerə uzaqlaş! Tövbə edib getdiyi yerə yaxınlaş!» deyə vəhy etdi. Və mələklərə: «Hər iki tərəfin məsafəsini ölçün!» deyə buyurdu. Mələklər də hər iki tərəfi ölçdülər. Tövbəkarın gedəcəyi yerə bir qarış yaxın olduğunu gördülər. Bundan ötrü də (Allah) onun günahlarını bağışladı»[85].

## *Mələklər Möminlərin Canlarını Rahatlıqla Alar Və Onları Müjdələyərlər*

***«And olsun (möminlərin canını) rahatlıqla alanlara». (ən-Naziat 2). Şübhəsiz ki: «Rəbbimiz Allahdır!» deyən, sonra da düz***

[85] Buxari, Müslim.

***olan kəslərə (ölüm ayağında) mələklər nazil olub belə deyəcəklər: «Qorxmayın və kədərlənməyin! Sizə vəd olunan Cənnətlə sevinin! Biz dünya həyatında da, axirətdə də sizin dostlarınızıq. Orada sizin üçün nəfsinizin çəkə biləcəyi hər şey hazırlanmışdır. Orada istədiyiniz hər şey vardır». (Fussilət 30-31).***

## ***Mələklərin Möminləri Sevmələri***

Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Əgər Allah bir qulu sevərsə əmr edir Cəbrailə: «Şübhəsiz Allah filan qulu sevər, sən də onu sev!» deyə nida edər. Cəbrail - *əleyhissəlam* - da onu sevər. Sonra Cəbrail - *əleyhissəlam* - da səmadakıları səsləyərək: «Şübhəsiz Allah filan qulu sevir, siz də onu sevin!». Səmadakılar da onu sevərlər. Sonra da onun sözü yer üzündə məqbul (qəbul) sayılar»[86].

## ***Mələklərin Möminləri Doğru Yola Yönəltmələri***

Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Süleyman b. Davud (Allahın salamı iksinin də üzərinə olsun): «Şübhəsiz bu gecə yetmiş (Bəzi rəvayətlərdə **90**, bəzilərində **99**, bəzilərində **100**) zövcəmi (xanımlarımı) dolaşacağam. Zövcələrimdən hər biri Allah yolunda vuruşacaq bir süvari doğacaq» dedi. Bu an yoldaşı olan mələk: «***İnşəallah*** de!» dedi. Lakin o, ***İnşəallah*** deməyi unutdu. Bunundan sonra o, qadınlardan biri xaric, heç biri hamilə olmadı. O, da xəstə olan bir uşaq doğdu». Sonra Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Nəfsim əlində olan Allaha and olsun ki, əgər ***İnşəallah*** demiş olsaydı hər biri Allah yolunda vuruşacaq süvarilər doğardılar (Başqa rəvayətdə: Əgər ***İnşəallah*** demiş olsaydı vədini yerinə yetirmiş olardı və öz istəyinin yerinə yetməsi üçün daha çox ümüdü olardı)»[87].

## ***Mələklərin Möminlər Üçün Xeyir-Dua Diləmələ-ri***

[86] Buxari 3209, Müslim 2637.

[87] Buxari 5242, Müslim 1654, Nəsəi 7/30, 31, İmam Əhməd 2/229, 275, 506, Tirmizi 1532.

***“Doğrudan da, Allah və Onun mələkləri Peyğəmbərə xeyir-dua verirlər. Ey iman gətirənlər! Siz də ona xeyir-dua verib kamil ədəb-ərkanla salamlayın”. (əl-Əhzab 56). “Sizi zülmətlərdən nura çıxartmaq üçün sizə rəhm edən Odur. Onun mələkləri də sizin üçün bağışlanma diləyərlər. Allah möminlərə qarşı Rəhmlidir”. (əl-Əhzab 43).*** Uca və Böyük Allahın xeyir-duası - tərif və rəhmətdir, mələklərin xeyir-duası – bağışlanma diləməkdir.

## ***Mələklərin İnsanlara Xeyri Öyrədənə Xeyir-Dua Etmələri***

Əbu Umәmə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Həqiqətən Allah, mələkləri, göydə və yerdə olanlar, qarışqa öz yuvasında hətta balıqlarda xeyir və faydalı (elm) öyrədənə dua edirlər»[88].

## ***Mələklərin Birinci Səfdə Duranlara Və Cəmaat Namazını Gözləyənlərə Xeyir-Dua Etmələri***

Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Namazın girmə vaxtını gözləyən insanlar üçün mələklər Allaha dua edərək, Ya Rəbbimiz onu bağışla, ona rəhm et! – (dəstnamazı) pozlana qədər»[89]. Bəra İbn Azib - *radıyallahu anhu* - rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Həqiqətən Allah və mələkləri birinci səff üçün dua edərlər (Başqa rəvayətdə: Birinci səfdə duaranlar üçün)»[90]. Aişə - *radıyallahu anhə* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Şübhəsiz Allah və Mələkləri səflərin sağında olanlara rəhmət və istiğfar diləyərlər»[91].

## ***Mələklər səfləri dolduranlar üçün xeyir-dua edirlər***

[88] Tirmizi 2161, 2685, əl-Albani «Səhih».

[89] Buxari 647, Müslim 649.

[90] Əbu Davud 618, 664, İbn Məcə 781, əl-Albani «Səhih».

[91] Əbu Davud 676, əl-Albani «Səhih».

Aişə - *radıyallahu anhə* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: Şübhəsiz ki, (namazda) səffləri dolduranlara Allah rəhmət diliyər və mələklər də dua edərək günahlarının bağışlanmasını diləyərlər (xeyir-dua). Kim səffdə olan bir boşluğu doldurarsa Allah da onu bir dərə yüksəldər"[92].

## ***Mələklər Səxur Edənlərə Xeyir-Dua Edirlər***

İbn Ömər - *radıyallahu anhu* - rəvayət edir ki, Peyğəmbər buyurdu: "Həqiqətən Allah və mələkləri səxur edənlər üçün bağışlanma diləyirlər"[93].

## ***Mələklərin Peyğəmbər – Sallallahu Aleyhi Və Səlləm – Ə Salavat Gətirən Üçün Xeyir-Dua Etmələri***

Amr İbn Rabia - *radıyallahu anhu* - rəvayət edir ki: «Allah Elçisi – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mənə salavat edən elə bir bəndə yoxdur ki, salavat etdiyi müddətdə mələklər onun üçün dua etməsin. Bəndə bunu istər az etsin, istərsə də çox etsin»[94].

## ***Mələklər Möminlərin Salamını Peyğəmbərə Çatdırırlar***

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Doğrudan da, Allahın yer üzünü gəzib-dolaşan mələkləri vardır ki, ümmətimin salamını mənə çatdırırlar!»[95]

## ***Mələklərin Xəstəni Ziyarət Edən Üçün Xeyir-Dua Etmələri***

Əli İbn Əbu Talib - *radıyallahu anhu* - rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir kəs öz xəstə qardaşını səhər ziyarət etməyə getsə onunla bərabər yetmiş min mələk çıxar ki, onun üçün axşamadək bağışlanma diləyər və o

---

[92] İbn Məcə 995, əl-Albani «Səhih».
[93] Təbərani "Mucamul Əvsat", əl-Albani "Səhihul Cəmi" 1844.
[94] əs-Suyuti "Cəmius-Sağir" 10891, Əhməd 15680, 15718, əl-Albani «Sahihul-Cəmius-Sağir» 5744.
[95] Nəsəi; Həkim, 2/421. əl-Albani «Səhih Nəsai», 1/274, "Mişkət" 924.

Cənnətdə bir baxça qazanar, əgər xəstəni axşam ziyarət etsə onunla yetmiş min mələk çıxar ki, səhərə qədər onun üçün bağışlanma diliyər və o Cənnətdə bir baxça qazanar»[96].

## ***Mələklər Möminlərin Duasından Sonra Amin – Deyirlər***

Əbu Dərda - *radıyallahu anhu* - rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və sәlləm* – buyurdu: "Həqiqətən, müsəlman bəndənin yanında olmayan qardaşı üçün etdiyi dua qəbuldur. Dua edənin başı üstə təyin olunmuş bir mələk vardır. Qardaşı üçün dua edib hər dəfə xeyir dilədikdə mələk: "Amin! Sənə də onun misli qədər çatsın"- deyər. Sonra mən bazarda Əbu Dərda - *radıyallahu anhu* - ilə rastlaşdım. O da bunu mənə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən eynilə rəvayət etdi[97]. Ummu Sələmə - *radıyallahu anhə* - rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Əbu Sələmə - *radıyallahu anhu* - nun yanına daxil oldu. Gözləri açıq qalmışdı onları bağladı sonra buyurdu: "Həqiqətən ruh çıxdığı zaman gözlər onu təqib edər". Bu sözlərdən sonra ev əhlindən bəziləri fəryad etməyə başladılar. Peyğəmbər: "Xeyirdən başqa dua etməyin. Çünki mələklər söylədiyiniz (hər bir) sözə amin deyirlər..."[98].

## ***Mələklərin Cümə Günü İnsanları Qeyd Etmələri***

Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Cümə günü oldu mu məscidin hər bir qapısı üzərində mələklər durub sıra ilə (tez) gələnləri qeyd edərlər. İmam xütbə vermək üçün çıxdımı onlar səhifələri bağlayıb xütbəni dinləyərlər»[99].

## ***Mələklərin qula savabı yazmaq üçün yarışmaları***

[96] Səhih Tirmizi 1/286, Səhih İbn Məcə 1/244. Əbu Davud 3098, 3100, əl-Albani "Səhih Muquf".
[97] Buxari "Ədəbul Mufrad" 625, əl-Albani "Səhih", Müslim 2733, 7105.
[98] Muxtəsər Müslim 456, 920, İbn Məcə 1447.
[99] Buxari, Müslim, əl-Albani "Mişkət" 1384.

Rifə İbn Rafi - *radıyallahu anhu* - rəvayət edir ki, bir gün biz Peyğəmbər – *sallallahu aleyhi və salləm* – in arxasında namaz qıldıq. Nə zaman ki, Rukudan başını qaldırdıqa buyurdu: "Səmiallahu Limən Həmidəh". Arxada olan bir kişi: "Rabbənə və ləkəl Həmd, Həmdən kəsiran tayyibən mubarəkən fih" dedi. Namaz bitdikdən sonra Peyğəmbər: "Bu sözləri kim söylədi?" deyə soruşdu. Adam: "Mən" dedi. Peyğəmbər: "Mən otuzdan çox mələk gördüm ki, bu əcri sənin üçün hansı biri daha tez yazacaq deyə (birinci yazmaqdan) ötrü bir-birilə yarışa girmişdi"[100].

## ***Mələklər Bir-Birilərini Əvəz Edərlər***

Əbu Hureyra - *radıyallahu anhu* - rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: "Bir dəstə mələk gecələr, bir dəstə mələk də gündüzlər növbə ilə sizin yanınıza gəlir, onlar sübh və əsr namazlarında bir yerə toplanırlar. Bundan sonra gecəni[101] sizin aranızda keçirən mələklər (səmaya) qalxır və Allah onlardan: "Siz Mənim qullarımı nə vəziyyətdə tərk etmisiniz?"– deyə soruşur, halbuki O, qullarının (nə etdiklərini) daha yaxşı bilir. Bununla belə onlar deyirlər: "Biz onları namaz qıldıqları halda tərk etdik, yanlarına gəldikdə də onlar namaz qılırdılar"[102]. ***"Çünki sübh çağı oxunan Quranın şahidləri olur". (əl-İsra 78).***

## ***Mələklər Gözəl Quran Oxuyan Möminin Yanına Enərlər***

Bəra b. Azim - *radıyallahu anhu* – rəvayət edir ki, bir nəfər Kəhf surəsini oxuyurdu. Yanında isə iplə bağlı atı da var idi. Bu vaxt bir bulud kölgə salaraq ona yaxınlaşmağa başladı. At isə hürkdü.

---

[100] Səhih Kəlimə 76, Buxari 799.

[101] Hədisdə: "Gecəni sizin aranızda keçirən mələklər"- deyildikdə təkcə onlar deyil, habelə gündüzlər möminlərin arasında olub növbəsi yetişdikdən sonra səmaya qalxan mələklər də nəzərdə tutulur. Bu izah ibn Xuzeymənin "Səhih" əsərində mötəbər isnadla rəvayət edilən hədisdə öz təsdiqini tapmışdır. Bu hədisdə Peyğəmbər – *sallallahu aleyhi və salləm* – demişdir: "...Onlar sübh namazında bir yerə toplandıqdan sonra gecəni sizin aranızda keçirən mələklər səmaya qalxır, qalanları isə sizin aranızda qalırlar, habelə əsr namazında bir yerə toplandıqdan sonra gündüzü sizin aranızda keçirən mələklər səmaya qalxır, qalanları isə sizin aranızda qalırlar...". İbn Həcər "Fəthul-Bari" 2/330.

[102] Buxari, 555, 3223, 7429, Müslim 632, 1464.

Səhəri bu kimsə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in yanına gələrək olanları ona başa saldı. Peyğəmbər: «Bu bir səkinət olub Quran üçün enmişdir”[103]. Useyd İbn Xudeyr - *radıyallahu anhu* – deyir ki, xurma qurudmaq üçün düzəldilmiş anbarda idim. Bəqərə surəsini oxuyurdum. Birdəm atım hürkdü. Mən Quran oxumağa davam etdim, atım yenə də hürkdü. Mən yenə də oxumağa davam etdim. Atım yenə də hürkdü. Qorxdum ki, at (oğlum) Yəhyanı ayaqlayar. Uşağa yaxınlaşıb (qucağıma götürdükdə) başımın üzərində (səmada) havada sallanaraq çıraq kimi nur saçan buluda oxşar bir şeylər gördüm. Sonra səmaya yüksələrək yox oldular. Səhəri Peyğəmbər in yanına gələrək dedim: Ya Rəsulullah! Dünən gecə anbarda Quran oxuyurdum, bu zaman atım hürkdü”. Peyğəmbər: “Oxu! Əbu Xudeyr” deyə buyurdu. Mən: “Yenə oxumağa başladı, atım hürkdü” dedim. Peyğəmbər: “Oxu! Əbu Xudeyr” deyə buyurdu. Mən: “Yenə oxumağa başladı, atım hürkdü” dedim. Peyğəmbər: “Oxu! Əbu Xudeyr” deyə buyurdu. Sonra oxumağı dayandırdım. Çünki oğlum Yəhya atın yanında uzanmışdı. Qorxdum ki, onu tapdalıyar. İçində çıraq kimi nur saçan buluda oxşar bir şeylər grdüm. Lakin sonra yox oldular. Peyğəmbər: «Bilirsənmi bu nə idi?». Mən: «Xeyr» deyə cavab verdim. Peyğəmbər: «Bunlar Mələklər idi. Sənin səsinə (qulaq asmaq üçün) gəlmişlər. Əgər (səhərə qədər) oxumağa davam etsəydin bu mənzərəni insanlar da seyr edərdilər və onlar heç kəsə də gizli qalmazdırlar»[104].

## ***<u>Mələklərin Möminlər Üçün Bağışlanma Diləmələri</u>***

***«Mələklər də (ondan) bağışlanmağınızı dilərlər. Allah möminlərə rəhm edəndir». (əl-Əhzab 43). “Ərşi daşıyanlar və onun ətrafındakılar öz Rəbbinə həmd edərək onu tərifləyir, Ona iman gətirir və möminlər üçün də bağışlanma diləyirlər: "Ey Rəbbimiz! Sən mərhəmətin və elminlə hər şeyi əhatə edirsən. Tövbə edib Sənin***

---

[103] Müslim 796.

[104] Buxari 5018, Müslim 795, 796.

***yolunla gedənləri bağışla, onları Cəhənnəm əzabından xilas et! Ey Rəbbimiz! Onları da, onların atalarından, zövcələrindən və nəsillərindən olan əməlisalehləri də onlara vəd etdiyin Ədn bağlarına daxil et. Həqiqətən, Sən Qüdrətlisən, Müdriksən. Onları günahlarının cəzasını çəkməkdən azad et. O gün Sən kimi günahlarının cəzasını çəkməkdən azad etsən, ona rəhm etmiş olarsan. Məhz bu, böyük uğurdur". (əl-Mumin 7-9). "Sanki göylərin bir-birinin üstündən çatlayıb yarılmasına az qalır. Mələklər də Rəbbinə həmd ilə təriflər deyir və yerdəkilər üçün bağışlanma diləyirlər. Həqiqətən, Allah Bağışlayandır, Rəhmlidir". (əş-Şura 5).***

## *Mələklər Elm Məclislərini Əhatəyə Alarlar*

Əbu Dərda - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Hər kim elm öyrənmək üçün müəyyən bir yola çıxarsa Allah onun Cənnətə gedən yolunu asanlaşdırar. Mələklər elm tələbəsinin bu əməlindən xoş olduqları üçün qanadlarını onun üzərinə açarlar. Göylərdə və yerdə olan hər bir şey onun üçün bağışlanma (istiğfar) diləyər»[105]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər kim elm öyrənmək üçün müəyyən bir yola çıxarsa Allah onun Cənnətə gedən yolunu asantlaşdırar. Bir topluluq Allahın evlərindən birində toplanıb, Allahın kitabını oxuyar və öz aralarında onu müzakirə edərlərsə onlara Allah tərəfindən sakitlik enər, Allahın rəhməti onları örtər, mələklər onları əhatəyə alarlar, Allah onları öz dərgahında olanların yanında yad edər. Hər kim bu əməlləri gecikdirərsə, nəticəsi onu irəli hərəkət etməyə qoymaz (geri düşər)»[106]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Uca Allahın yer üzündə yolları dolaşıb zikr əhlini (məclislərini) axtaran bir qrup mələkləri vardır. Bu mələklər İzzət və Qüdrət sahibi olan Allahı zikr edən bir topluluğu tapdıqda bir-birlərinə: «Gəlin, axtardıqlarınız buradadır!» deyə səsləyirlər və

---

[105] Əbu Davud 3641, Səhih Tirmizi 2159, 2683.

[106] Müslim 2699.

zikr əhlini (məclisini) dünya səmasına qədər qanadlarıyla əhatəyə alırlar. (Zikr əhli Allahı yad edib qurtardıqdan sonra mələklər səmaya qalxarlar) Hər bir şeydən xəbərdar olan Allah onlara: «Qullarım nə haqda danışırdılar?» deyə buyurar. Mələklər: «Onlar Səni ***Təsbih***[107] edirdilər, Səni ***Təkbir***[108] edirdilər, Səni ***Tahmid***[109] edirdilər və Sənə təzim edirdilər!» deyərlər. Allah: «Məgər onlar Məni görüblərmi?» deyə buyurar. Mələklər: «Xeyr, Allaha and olsun ki, onlar Səni görməyiblər!». Allah: «Əgər onlar Məni görsəydilər necə?». Mələklər: «Əgər onlar Səni görmüş olsalardı Sənə daha çox ibadət edər, Sənə daha çox təzim edər və Səni daha çox təsbih edərdilər». Allah: «Onlar Məndən nə istəyirlər?». Mələklər: «Onlar Səndən Sənin Cənnətini istəyirlər!». Allah: «Onlar Mənim Cənnətimi görüblərmi?». Mələklər: «Xeyr, Allaha and olsun ki, onlar Sənin Cənnətini görməyiblər!». Allah: «Əgər onlar Mənim Cənnətimi görsəydilər necə?». Mələklər: «Əgər onlar Sənin Cənnətini görsəydilər onu qazanmaq üçün daha həris, daha istəkli və daha rəğbətli olardılar! (ora düşmək üçün)». Allah: «Onlar nədən sığınmağa çalışırdılar?». Mələklər: «Cəhənnəm atəşindən!». Allah: «Məgər onlar Mənim Cəhənnəmimi görüblərmi?». Mələklər: «Xeyr, Allaha and olsun ki, onlar Sənin Cəhənnəmini görməyiblər!». Allah: «Əgər onlar Mənim Cəhənnəmimi görsəydilər necə?». Mələklər: «Əgər onlar Sənin Cəhənnəmini görsəydilər ondan daha çox (sənə) sığınar (qaçar) və daha çox qorxardılar!». Allah: «O, halda sizlər şahid olun ki, mən onları bağışladım!» deyə buyurdu. Bu an mələklərdən biri: «Onların arasında bir kimsə var ki, onlardan deyildir. Yalnız bir ehtiyac (bir iş) üçün onların yanına gəlmişdir!» dedi. Allah: «Onlar elə bir kimsələrdir ki, onlarla oturan kimsə bədbəxt olmaz!» deyə buyurdu[110]. Başqa rəvayətdə - Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və sələm* – buyurdu:

---

107 **Subhənəllah**
108 **Allahu Əkbər**
109 **Əlhəmdulilləh**
110 Buxari 6408.

«Şübhəsiz ki, Allahın yer üzündə dolaşan bir qrup mələkləri vardır. Bu mələklər zikr məclislərini axtararlar. Nəhayət onlar Allahı zikr edən bir məclisi tapdıqda onlarla birlikdə oturar və bir-birlərini qanadları ilə əhatəyə alarlar. O, vaxta qədər ki, dünya ilə səma arasını doldurarlar. Zikr əhli dağıldıqdan sonra (mələklər) səmaya yüksələrlər. Hər şeydən xəbərdar olan Allah qullarının halını mələklərdən daha yaxşı bildiyi halda mələklərə: «Siz haradan gəlirsiniz?» deyə buyurar. Mələklər: «Biz yer üzündə Sənin bir qrup qullarının yanından gəlirik ki, onlar Səni ***Təsbih*** edir, Səni ***Təkbir*** edir və Səndən başqa haqq ilah olmaığını ***Təhlil*** edir, Səni ***Təhmid*** edir və Səndən istəyirlər!». Allah: «Onlar Məndən nə istəyirlər?». Mələklər: «Onlar Səndən Sənin Cənnətini istəyirlər!». Allah: «Məgər onlar Mənim Cənnətimi görüblərmi?». Mələklər: «Xeyr, ey Rəbbimiz! Onlar Sənin Cənnətini görməyiblər!». Allah: «Əgər onlar Mənim Cənnətimi görsələrdi necə olardı?». Mələklər: «Onlar Səndən aman istəyirlər?». Allah: «Nəyə qarşı Məndən aman (sığınacaq) istəyirlər?». Mələklər: «Cəhənnəm atəşinə qarşı!». Allah: «Onlar Mənim atəşimi görüblərmi?». Mələklər: «Xeyr, onlar Sənin atəşini görməyiblər». Allah: «Əgər onlar Mənim atəşimi görsələrdi necə olardı?». Mələklər: «Onlar Səndən məğfirət diləyirlər?». Allah: «(Siz şahid olun ki) Mən onları bağışladım, istədiklərini onlara verdim və onları aman (sığınacaq) istədikləri şeydən qorudum!». Mələklər: «Ey Rəbbimiz! Onların arasında çox günahkar bir qulun da vardır. Sadəcə onların yanından keçərkən onlarla oturdu!». Allah: «Mən onu da bağışladım. Onlar elə bir topluluqdur ki, onlarla oturub-duran kimsə bədbəxt olmaz!» deyə buyurdu[111]. Hənzələ b. ər-Rəbi b. Sayfi əl-Useyyidi ət-Təmimi – *radıyallahu anhu* –, Əbu Bəkr – *radıyallahu anhu* – ilə birlikdə Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in hüzuruna girərək dedi: «Hənzələ münafiqlik etdi, ya Rəsulallah!». Rəsulallah: «Nə oldu belə?» Hənzələ: «Ey Allahın Rəsulu! Sənin yanında olduğumuz zaman bizlərə (Cəhənnəm)

---

[111] Müslim 2689.

atəşini və Cənnəti xatırladırsan. Elə bil ki, bunları gözlərimizlə görmüş kimi oluruq. Ancaq sənin yanından ayrıldığımız zaman ailə, uşaqlar və dünya keçimi ilə o, qədər məşğul oluruq ki, (bizə xatırlatdığın bu şeyləri) unuduruq». Rəsulullah: «Nəfsim əlində olan Allaha and olsun ki, əgər sizlər mənim yanımdaykən və zikirdəykən olduğunuz hal üzrə olmağa (hər yerdə) davam etsəniz şübhəsiz mələklər sizinlə döşəklərnizdə və yollarnızda toqquşardılar». Başqa rəvayətdə: «Yollarda sizə salam verərdilər». Bir başqa rəvayətdə isə: «Sizləri evlərnizdə ziyarət edərdilər»[112].

## *Mələklərin Möminləri Müjdələmələri*

Mələklərin İbrahim – *əleyhissəlam* – ı oğlu İshaqın olması ilə - ***"İbrahimin möhtərəm qonaqlarının əhvalatı sənə gəlib çatdımı? Onlar onun yanına daxil olub: "Sənə salam olsun!"– dedilər. İbrahim: "Sizə də salam olsun! Siz yad adamlara oxşayırsınız!"– dedi. O, təşviş içində ailəsinin yanına getdi və kök bir buzov qızardıb gətirdi. Onu qabaqlarına qoyub: "Yemək yeməyəcəksinizmi?"– dedi. O, qonaqların yemədiklərini görüb onlardan qorxuya düşdü. Onlar: "Qorxma!"– dedilər və ona elmli bir oğlan uşağı ilə müjdə verdilər". (əz-Zəryat 24-28). "Onun arvadı pərdə arxasında durmuşdu. O, güldü. Biz onu İshaqla, (İshaqın) ardınca da Yaqubla müjdələdik. O dedi: "Vay halıma! Mən bir qoca qarı, bu ərim də bir qoca kişi olduğu halda doğa bilərəmmi? Doğrusu, bu, təəccüblü bir şeydir". (Hud 71-72).*** Məryəmı İsa – *əleyhissəlam* – ın olması ilə - ***"Məryəm dedi: "Mən səndən Mərhəmətli Allaha sığınıram! Əgər müttəqisənsə, mənə toxunma". Mələk dedi: "Mən sənə ancaq pak bir oğlan bəxş etmək üçün Rəbbinin elçisiyəm". Məryəm dedi: "Mənə bir insan toxunmadığı və özüm də zinakar olmadığım halda, necə mənim övladım ola bilər?" Mələk dedi: «Bu belədir, lakin Rəbbin buyurdu: "Bu, Mənim üçün asandır. Biz onu insanlar üçün bir möcüzə və Öz tərəfimizdən bir mərhəmət edəcəyik. Bu, hökmü verilmiş bir işdir"». Məryəm uşağa qaldı və***

---

[112] Müslim, Tirmizi 2514, İbn Məcə 4239, Əhməd 2/304,305, əl-Albani «Səhih Hədislər Silsiləsi» 1948, «Səhihul Cəmius Səğir» 7073, «Mişkətul Məsabih» 2268.

***bətnindəki ilə birlikdə gedib uzaq bir yerə çəkildi". (Məryəm 18-22).*** Zəkəriyya – *əleyhissəlam* – oğlu Yəhya – *əleyhissəlam* – ın olması ilə - ***"Elə oradaca Zəkəriyya Rəbbinə dua edərək dedi: "Ey Rəbbim! Öz tərəfindən mənə pak bir nəsil bəxş et! Şübhəsiz ki, Sən duaları Eşidənsən". O, mehrabda durub namaz qılarkən mələklər onu çağırdılar: "Allah səni, Allah tərəfindən olan Kəlməni təsdiq edən, qövmünün ağası, nəfsinə hakim və əməlisalehlərdən bir peyğəmbər olacaq Yəhya ilə müjdələyir". (Ali İmran 38-39).*** Xədicə - *radıyallahu anhə* – ni Cənnətdə onun üçün hazırlanmış daş-qaşlı saray və Allahın salamı ilə - Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Hira mağarasında ikən yanına Cəbrail – *əleyhissəlam* - gəldi və dedi: «Ya Rəsulallah! Bu Xədicədir. Sənə doğru gəlir. Yanında bir qab da vardır. Xədicə sənin yanına çatdıqda ona Allahdan və məndən salam de və ona söylə ki, Cənnətdə onu səsdən, gurultudan və məşəqqətdən uzaq daş-qaşlı bir saray gözləyir»[113].

## ***Mələklər Və Yuxu***

Aişə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ya Aişə! Sən **3** gecə yuxumda mənə göstərildin. Sənin surətini mənə ipəkli bir parçada mələk gətirdi və: «Bu rəsmin sahibi sənin zövcəndir!» dedi. Nəhayət mən sənin üzünü açınca baxdım ki, o surət sənsən»[114]. Əbu Umərnə əl-Bəhili - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Yatdığım zaman yanıma iki nəfər (mələk) gəldi. Məni qollarımdan tutub, çıxılması olduqca çətin olan bir dağın yanına gətirdilər və çıx dedilər». Mən bunu bacarmaram, dedikdə: «Biz onu sənin üçün asanlaşdırarıq» dedilər. Mən də dağa çıxdıqda dağın təpəsindən olduqca dəhşətli səslər eşitməyə başladım. «Bu səslər kimin səsləridir?» dedim: «Bunlar Cəhənnəmliklərin ulaşmalarıdır» dedilər. Sonra məni götürüb, topuqlarından asılmış bir topluluğun yanına gətirdilər. Ağızları parça-parça olmuş,

---

[113] Buxari 3820, Müslim 2432.

[114] Buxari 3895, 5125, 7011, Müslim 2438.

ağızlarından qan axırdı. Mən dedim: «Bunlar kimlərdir?» Bunlar oruc açmaları halal olmadan qabaq oruclarını yeyənlərdir[115].

## ***Mələklərin Döyüşlərdə Müsəlmanlara Kömək Etməsi***

***«Siz zəif olduğunuz halda Allah, Bədrdə sizə yardım etdi. Elə isə Allahdan qorxun ki, bəlkə şükür edəsiniz. O vaxt sən möminlərə demişdin: Rəbbinizin üç min mələk endirərək imdadınıza yetişməsi sizə kifayət etməzmi. Bəli əgər səbr edib (Allahdan) qorxsanız, onlar (Məkkə müşrikləri) qəzəblə üstünüzə gəldikləri zaman Rəbbiniz artıq beş min nişan qoyulmuş mələklə sizə yardım edər». (Ali-İmran 123-125). "O, vaxt siz Rəbbinizdən kömək diləyirdiniz. O da: "Mən sizə bir-birinin ardınca gələn min mələklə yardım edəcəyəm"– deyə duanızı qəbul etmişdi". (əl-Ənfal 9).*** Rifa İbn Rafi əz-Zurani - *radıyallahu anhu* – rəvayət edir ki, Cəbrail – *əleyhissəlam* – Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Siz Bədr döyüşündə iştirak edənləri nə sayırsınız». (Peyğəmbər) buyurdu: «Müsəlmanların ən xeyirliləri». Cəbrail – *əleyhissəlam* – dedi: «Mələklərdən də Bədr mələkləri belədir»[116]. İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Bədr döyüşündə demişdir: "Budur, Cəbrail – *əleyhissəlam* – atının başından tutub, üstü-başı da yaraqlı-yasaqlı (gəlir)"[117]. ***"O zaman Rəbbin mələklərə: "Mən sizinləyəm! İman gətirənləri gücləndirin. Mən kafirlərin qəlbinə qorxu salacağam. Onların boyunlarını vurun və barmaqlarının hamısını kəsin!"– deyə vəhy etmişdi". (əl-Ənfal 12). "Allah bunu sizə ancaq bir müjdə və qəlbiniz bununla sakit olsun deyə etdi. Kömək ancaq Qüdrətli və Müdrik Allahdandır. Bu ona görə idi ki, Allah bununla kafirlərin bir bölüyünü qırğına versin və ya onları darmadağın etsin ki, məyus halda geri dönsünlər". (Ali İmran 126-127).*** Əbu Zumeyl belə rəvayət edir: "İbn Abbas - *radıyallahu anhu* – mənə belə danışdı:

---

[115] əl-Albani «Səhih Tərğib» 1/420, H. 995.
[116] Buxari 3992, Əhməd 5/121.
[117] Buxari 3995.

“Müsəlman bir kişi önündə olan müşriki qovarkən qamçı zərbəsi eşitdi. Atın üzərindəki süvarı: “Haydı irəli, Heyzum!” deyə qışqırırdı. Önündəki müşriki kürəyi üstə yerə sərildiyini gördü. Ona baxdığı vaxt, burnunun əzilmiş, üzünün isə sanki qamçı zərbəsi ilə yarılmış olduğunu gördü. Hər yeri gömgöy olmuşdu. Ənsardan olan kişi Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gələrək ona bunu xəbər verdi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – belə buyurdu: “Doğru söylədin. Bu üçüncü səmadan gələn imdaddır. O gün yetmiş nəfər öldürdülər və yetmiş nəfər isə əsir aldılar[118]. Peyğəmbər Xəndək döyüşündən qayıtdıqdan sonra silahını yerə qoyub çimdi. Cəbrail - *əleyhissəlam* - başındakı tozu çırparaq onun yanına gəldi və: “Sən silahını yerə qoymusan? Allaha and olsun ki, biz hələ silahımızı yerə qoymamışıq. (Silahını götür) Onlara qarşı çıx” dedi. Peyğəmbər: “Kimə qarşı” dedim. O Bəni Qureyzə istiqamətinə işarə etdi”[119]. Sad İbn Əbu Vaqqas - *radıyallahu anhu* – belə rəvayət edir: “Uhud günü Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in sağında və solunda ağ paltarda iki kişi gördüm. Onları nə bundan əvvəl, nə də sonra görmüşəm.” Bu sözü ilə Cəbrail və Mikaili - *əleyhimussəlam* – ı qəsd edirdi. Başqa rəvayətdə isə belə deyilir: “Onun naminə şiddətlə vuruşurdular”[120].

## ***<u>Mələklər Peyğəmbərlərə Və Möminlərə Kömək Edirlər</u>***

Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Əbu Cəhl: «Muhəmməd sizin aranızda üzünü torpağa sürtürmü?» Ona: «Bəli, sürtür» - dedilər. O, dedi: «Lat və Uzzaya and olsun ki, əgər onun belə etdiyini görsəm boynundan tutub torpağa sürtəcəyəm». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – namaz qılmağa başladığı vaxt Əbu Cəhl gəldi və onun boynunu basmaq istədi. Bu vaxt sanki əlləri ilə özünü qoruyaraq geri çəkildi. Ona: «Sənə nə oldu?» deyə soruşduqda o dedi: «Mənimlə onun arasında içi odla dolu xəndək

---

[118] Müslim 1763.
[119] Buxari 4117, Müslim 1769.
[120] Müslim.

var idi və mənim ona yaxınlaşmağıma mane olurdu». Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «Əgər o, mənə yaxınlaşmış olsaydı mələklər onu parça-parça edərdilər»[121]. Həcər son dəfə Mərva təpəsinə çıxdıqda bir səs eşitdi. Öz-özünə: «Sus!» deyərək diqqətlə qulaq asmağa başladı və eyni səsi yenə də eşitdi. (Həcər): «Sən (səsini) mənə eşitdirdin. (Bəs) mənə yardım edə bilərsənmi?» dedi və bir də baxdı ki, (indiki) Zəm-Zəm quyusunun yerində bir mələk (Cəbrail) topuğu (və ya qanadı) ilə yeri qazır. Nəhayət oradan su fəvvarə ilə fışqırmağa başladı. (Həcər) dərhal suyun ətrafını hovuz kimi düzəltməyə başladı. Bir tərəfdən əli ilə düzəldir, digər tərəfdən isə tuluğu doldururdu. O, suyu doldurduqca su oradan fəvvarə ilə fışqırırdı. Başqa rəvayətdə: Peyğəmbər: «(Həcər) suyu oradan ovuc-ovuc aldıqca su oradan ovucladığı miqdarda fışqırırdı». Başqa rəvayətdə: İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «Allah İsmail – *əleyhissəlam* – ın anasına rəhmət etsin! Əgər o, Zəm-Zəm quyusunu başlı-başına buraxsaydı və ya onu ovuclamasaydı o, (yer üzündə) axar bir su olardı» dedi və (sözünə davam edərək Həcər) sudan içdi və uşağı əmizdirdi. Mələk onlara: «Həlak olmaqdan qorxmayın. Çünkü burada bu oğlan uşağının və atasının tikəcəkləri Allahın evi olacaqdır. Allah ona (ibadət edənləri) tək buraxmaz» deyə cavab verdi…”[122].

***“Darda qalan kimsə yalvardığı zaman ona cavab verən, şəri sovuşduran və sizi yer üzünün varisləri edən kimdir?...”. (ən-Nəml 62).*** İbn Kəsir – *rahmətullahi aleyhi* - ayənin təfsirində rəvayət edir ki, əd-Daki əs-Sufi kimi tanınan Əbu Bakr Muhəmməd İbn Davud əd-Dinavari deyir ki: “Ulağım vardı. Onunla insanları Dəməşqdən Zabdan şəhərinə aparırdım. Bir gün yenə də bir nəfəri aparmalı oldum. Yolda köhnə bir cığıra rast gəldik. Mənə: “Bu cığırla gedək. Qısa yoldur” dedi. Mən: “Yaxşı yol deyil” dedim. O: “Qısa yoldur” dedi. Bu yolla gedəsi olduq. Cığırın çoxlu ölülər olan keçilməz

---

[121] Müslim 2797.
[122] Buxari 3364.

(dar) hissəsinə gəlib çatdırda adam: “Ulağı saxla mən düşüm” dedi. Yerə düşdükdə qollarını çırmalayaraq üstümə bıçaq çıxardı. Mən qaçmağa başladım. O, da dalımca düşdü. Mən: “Allah xatirini ulağı və üstündə olanları götür. Lakin mənə toxunma” dedi. O: “Ulağ onunsuzda mənimdir. Lakin mən səni öldürməsəm sağ buraxmaram” dedi. Mən onu Allahın əzabı ilə qorxuddum. Lakinəhəmiyyət vermədi. Sonda təslim oldum. Ondan xaiş etdim ki, iki rükət namaz qılmağıma icazə versin. O: “Tələs” dedi. Namazda Quran oxuya bilmədim. Özümü o, qədər itirmişdim ki, bir ayədə olsun belə yadıma düşmürdü. O, isə: “Tez elə, qurtar görək” deyirdi. Bu vaxt Allah mənim dilimə: ***“Darda qalan kimsə yalvardığı zaman ona cavab verən, şəri sovuşduran və sizi yer üzünün varisləri edən kimdir?...”. (ən-Nəml 62).*** Bu ayələri zikr etməyi ilham etdi. Bu an cığırın başında əlində nizə olan bir atlı peyda oldu və həmən adamı düz ürəyindən vuraraq öldürdü. Mən dəhşət içərisində: “Allah xatirinə de görüm sən kimsən?” dedi. O: “Məln darda qalanın yalvardığı zaman imadadına çatan, şəri sovuşduranın Elçisiyəm” dedi. Hər bir şeyimi götürüb sağ-salamat qayıtdım”.

## Mələklər Möminlərin Cənazəsində İştirak Edərlər

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Sad İbn Muaz - *radıyallahu anhu* – barəsində buyurdu: “Onun ölümü ilə (Rahmənin) Ərşi titrədi, səma qapıları açıldı və yetmiş min mələk onun cənazəsində iştirak etmişdir…”[123].

## Mələklər Şəhidləri Qanadları İlə Örtərlər

Cabir İbn Abdullah - *radıyallahu anhu* – demişdir: “Atam (Uhud döyüşündə) şəhid olduqda mən onun üzündəki örtüyü götürüb ağlamağa başladım. Əshabələr mənə (örtüyü onun üzündən götürməyə) qoymurdular. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – isə bunu mənə qadağan etmədi. Bibim Fatimə də ağlamağa

---

[123] Buxari 3802, Müslim 2466, Nəsəi 2055.

başladı. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – (ona) dedi: "Nə üçün ağlayırsan və ya ağlama). Siz onu (döyüş meydanından) götürüb aparanadək mələklər öz qanadları ilə onun üstünə kölgə salmışdılar (Mələklər hələ də qanadları ilə onu örtüblər)"[124].

## ***<u>Mələklər Məsih Dəccəlin Məkkə Və Mədinəyə Girməsinin Qarşısını Alacaqlar</u>***

«...Mən Məsihəm. Mənə çıxmaq üçün izn verilən zaman yaxınlaşır. İzn verildikdə mən yer üzündə gəzəcəyəm və qırx gecə içində elə bir yer olmayacaq ki, ora ayağım dəyməsin. Məkkə və Mədinədən başqa. Bunların hər iksi də mənə haram edilmişdir. Bu iki şəhərin hər girəcəyində dayanan mələklər əllərindəki qılınc ilə məni vuraraq bu şəhərlərə girməyə qoymazlar...»[125]. Əbu Bəkrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Məsih Dəccəl Mədinəyə girməz. O, zaman Mədinənin **7** qapısı vardır və hər qapıda iki mələk vardır"[126]. Abdullah İbn Amr - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "(Dəccəl) Kəbəyə və Beytul Məqdisə girməz (Başqa rəvayətdə: Dörd yerə girməz: Kəbə, Məscidul Nəbəviyyə, Məscidul Aqsa və Tur (dağı)[127])"[128].

## ***<u>İsa - Əleyhissəlam - İki Mələyin Qanadında Enəcəkdir</u>***

"...Dəccəl öz fitnə-fəsadını yaydığı vaxt Allah Məryəm oğlu Məsihi, İsa – *əleyhissəlam* – ı göndərər. O, da iki paltara bürünmüş və əllərini iki mələyin qanadlarına qoyaraq Dəməşqin şərq tərəfindəki ağ minarəyə enər..."[129].

---

[124] Buxari 1244, 2816.

[125] Müslim 2942.

[126] Buxari 2/664, 6/2607, 7125, İbn Hibban 9/48, 15/29,216, Həkim 4/583, Məcmuaz Zəvaid 7/332, İbn Əbi Şeybə 6/406, 7/492, Fəthul Bəri 10/191.

[127] Əhməd 5/364,434, Fəthul Bəri 13/105.

[128] Qurtubi 4/89, Məcmuaz Zəvaid 7/350, Fəthul Bəri 13/104.

[129] Müslim 2252, 2940.

## ***Mələklər Öz Qanadlarını Şam Diyarının Üzərinə Sərirlər***

Zeyd İbn Sabit əl-Ənsari - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Tubə (xoşbəxt) Şam, Tubə (xoşbəxt) Şam". Ondan: "Nəyə görə Ya Rəsulullah" dedilər. O: "Mələklər öz qanadlarını Şam diyarının üzərinə sərərlər" deyə buyurdu[130].

## ***Mələklərlə Bərabər Amin Deyənin Mükafatı***

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "İmam – Ğeyril Məğdubi Aleyhim Vələddallin deyincə siz də: Amin" deyin. Kimi (Amin) sözü mələklərin (Amin) sözü ilə üst-üstə düşərsə onun keçmiş günahları bağışlanar"[131]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Sizdən biriniz Amin – dediyi zaman mələklər də səmada Amin deyərlər. Əgər hər ikisi də bir-birinə müvafiq olarsa küçmiş günahları bağışlanar"[132]. Əbu Hureyra - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "İmam: "Səmi Allahu limən həmidəh" deyəndə siz: "Allahummə, Rabbənə ləkəl həmd" deyin. Bilin ki, kimin sözü mələklərin sözü ilə üst-üstə düşsə, onun keçmiş günahları bağışlanar"[133].

## ***Musa - Əleyhissəlam – In Ölüm Mələyinin Gözünü Çıxarması***

Əbu Hureyra - *radıyallahu anhu* – rəvayət edir ki: "Ölüm mələyi Musa - *əleyhissəlam* - ın yanına göndərildi. Mələk Musa - *əleyhissəlam* - ın yanına gəldikdə Musa - *əleyhissəlam* - onu vurdu və onun gözü çıxdı. Mələk Rəbbinin yanına qayıdıb dedi: "Sən məni ölmək istəməyən bir bəndənin yanına göndərdin." Allah onun gözünü yerinə qaytardı və buyurdu: "Qayıt ona de ki: "Əlini

---

130 Həkim "Mustədrək" 2900, Tirmizi 3954, İbn Hibban 7314, Əhməd 21606, 21646, əl-Albani "Səhih".

131 Buxari 780, Müslim 410, Əbu Davud 935, 936.

132 Buxari 781, Səhih Tərğib 514.

133 Buxari 796.

öküzün belinə qoysun. Əlinə gələn tüklərin sayı qədər – hər bir tükün müqabilində bir il ömrü artacaq." Musa: "Ey Rəbbim! Sonra nə olacaq?" Allah buyurdu: "Sonra öləcəksən!" Musa: "Elə isə indi (ölmək istəyirəm)." Sonra da Allahdan onu atılmış bir daşın uçub düşdüyü məsafə qədər müqəddəs torpağa yaxınlaşdırmasını dilədi". Əbu Hureyra - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Əgər orada olsaydım, sizə onun yolun kənarında, qırmızı qum təpəsinin yanında (yerləşən) qəbrini göstərərdim"[134]. Bəzi bidət əhli bu hədisin səhihliyini inkar edirlər. İbn Həcər – *rahmətullahi aleyhi* - onlara cavab verərək deyir ki: "Musa - *əleyhissəlam* - onun mələk olduğunu bilmirdi, çünki mələk onun yanına insan qiyafəsində gəlmiş və icazəsiz onun yanına daxil olmuşdu. Çünki Mələklər İbrahim və Lut - *əleyhimussəlam* - ın yanına gəldikləri zaman da Peyğəmbərlər onlar mələk olduqlarını ilk öncə bilmədilər. Çünki İbrahim - *əleyhissəlam* - onların mələk olduğunu bilsəydi onlara yemək ikram etməzdi, Lut - *əleyhissəlam* - onları mələk olduğunu bilsəydi onlara görə narahat olmazdı"[135]. İman Əhli isə belə deyər: ***"...Elmdə qüvvətli olanlar isə deyərlər: "Biz onlara iman gətirdik, hamısı bizim Rəbbimizdəndir". Bunu isə ancaq ağıl sahibləri dərk edərlər". (Ali İmran 7).***

## ***Adəm Oğullarına Əziyət Verən Şey Onlara Da Əziyyət Verir***

Mömin hər bir an insanlara əziyyət verməkdən qaçdığı kimi mələklərə də əziyyət verməməlidir. Əziyyət vermək isə bir çox şəkildə olur. Allah, Onun Elçisi və dinə aid olan məsələlərlə istehza edib, zarafatlaşmaq – *Allah Qorusun* – dindən çıxaran böyük küfürdü. ***"Münafiqlər, özlərinin qəlbində olanı xəbər verən bir surənin möminlərə nazil olmasından çəkinirlər. De: "Siz istehza edin! Şübhəsiz ki, Allah çəkindiyiniz şeyi üzə çıxaracaqdır". Onlardan nə üçün istehza etdiklərini soruşsan, deyərlər: "Biz***

---

[134] Buxari 1339, Müslim 2372.

[135] "Fəthul Bəri" 6/442.

***sadəcə boş-boş danışıb zarafatlaşırdıq!" De: "Allaha, Onun ayələrinə və Onun Elçisinə istehzamı edirsiniz? Üzrxahlıq etməyin! İman gətirdikdən sonra artıq kafir oldunuz". Sizlərdən bir qismini bağışlasaq da, digərlərinə günahkar olduqlarına görə əzab verərik". (ət-Tövbə 64-66).*** Ona görə Allahın qulu dilini onu Allahın əzabına düçar edəcək şeylərdən qorumalıdır.

***Həmçinin -*** Mələklər heykəl, surət və it olan heç bir evə girməzlər. Əbu Təlhə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mələklər it və şəkil olan evə girməzlər»[136]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Soğan və sarımsağ yeyən hər bir kəs bizim məscidə yaxın durmasın. Adəm oğullarına əziyyət verən şey mələklərə də əziyyət verir»[137]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İçində köpək və surət olan evə (rəhmət) mələkləri girməz»[138]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mələklər içində köpək və zınqırov olan heç bir səfərdə olan qəbiləyə yoldaşlıq etməzlər»[139]. Ammar İbn Yəsir - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Üç sinif insana mələklər yaxınlaşmaz: Kafir bir kimsənin leşinə, bədəninə qadınlara aid – ***Xaluq*** – qoxusunu sürtənə və cünub ikən dəstəmaz almadan yatan kimsəyə (Başqa rəvayətdə: Cünub halında olana, içki içənə və zəfəran yağından çox çəkənə)»[140].

## ***Namaz Vaxtı Qiblə Və Sağ Tərəfə Tüpürməyin Qadağan Edilməsi***

Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizdən biri namaza durduğu vaxt Rəbbinə müraciət edər. Rəbbi onunla qiblə arasındadır. O,

---

[136] Buxari, Müslim.
[137] Buxari, Müslim 567.
[138] Müslim 2106.
[139] Müslim 2113.
[140] Əbu Davud 4180, 4182, əl-Albani "Səhih Cəmi" 3060,

halda sizdən biri nə badə qiblə tərəfinə tüpürməsin»[141]. Huzeyfə İbn Yəmən - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiblə istiqamətinə tüpürən kimsə qiyamət günü tüpürdüyü iki gözünün arasında (Başqa rəvayətdə: Üzündə) olduğu halda gələcəkdir»[142]. İmam Nəvəvi – *rahmətullahi aleyhi* - deyir ki: «İstər namaz vaxtı, istər namazdan kənarda, istər məsciddə, istərsə də məsciddən kənarda bu əməl qadağan edilmişdir»[143]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Qoy sidən heç kimsə namaz vaxtı qarşısına (önünə) tüpürməsin. Çünki o, namazda olduğu müddətdə Rəbbi ilə müraciətdədir. Sağ tərəfə də tüpürməsin. Çünki ondan sağda mələk vardır. Lakin sol tərəfə və ya ayağının altına tüpürərək onu basdırsın"[144].

## Mələklərin Möminləri Salamlamaları

***«Rəbbindən qorxanlar dəstə-dəstə gətiriləcəklər. Nəhayət ora çatınca onun qapıları açılacaq və Cənnət gözətçiləri (onlara) Salam aleykum! (Sizə salam olsun) xoş gəldiniz. Əbədi qalacağınız Cənnətə daxil olun». (əz-Zumər 73).***

## Mələkləri Sevmək

Mömin bəndə mələklərin varlığına iman etdiyi kimi həmçinin onları sevməlidir. Çünki Kitab əhli olan bəzi Yəhudilər mələklərin bir qismini özlərinə düşmən, digərlərini isə dost sayırlar. Onlar deyirlər ki: "Cəbrail - *əleyhissəlam* - Yəhudilərin düşməmnidir, Mikail - *əleyhissəlam* - isə onların dostudur. Lakin Allah onların bu iddiasını rədd edərək: ***"De: "Cəbrailə düşmən olan kəs bilsin ki, Allahın izni ilə Quranı özündən əvvəlkiləri təsdiqləyən, möminlərə doğru yol göstərən və müjdə verən bir kitab kimi sənin qəlbinə o nazil etmişdir". Kim Allaha, Onun mələklərinə və elçilərinə, Cəbrailə və Mikailə düşməndirsə, şübhəsiz ki, Allah da o kafirlərə***

---

[141] Buxari 405, Müslim 551.

[142] Əbu Davud 3806, İbn Hibban 332, əl-Albani "Səhihdə" 222.

[143] əl-Albani «Səhihdə» 1/2/40.

[144] Buxari 416.

***düşməndir".(əl-Bəqərə 97-98).*** İbn Abbas – *radıyallahu anhu* – rəvayət edir ki, Yəhudi alimlərindən biri Rəsulullah - *səllallahu aleyhi və səlləm* – in yanına gələrək dedi: «Ey Əbul Qasım! Yalnız Peyğəmbərlərə məlum olan xüsusiyyətlər haqqında soruşacaqlarımız barəsində bizə xəbər ver!». Peyğəmbər: «İstədiyiniz şey barəsində soruşun, lakin Yaqub – *əleyhissəlam* – övladlarından vəd aldığı kimi siz də Allah qarşısında vəd verin ki, əgər görsəniz dediklərim doğrudur mənə tabe olub İslam dinini qəbul edəcəksiniz!» deyə buyurdu. Onlar: «Qoy sən deyən olsun» dedilər. Peyğəmbər: «İstədiyinizi soruşun!» deyə buyurdu. Onlar: «Dörd xüsusiyyət barəsində bizə xəbər ver: Tövrat nazil olmamışdan əvvəl İsrail (Yəqub – *əleyhissəlam* – ) özünə nəyi haram etmişdir? Kişinin belindən və qadının köksündən gələn suyun keyfiyyəti necədir və necə olur ki, uşaq oğlan olur? Yazıb oxumağı bacarmayan peyğəmbər necə yatır və hansı mələk onun sevimli dostudur?» dedilər. Peyğəmbər: «Dediklərinizə doğru cavab versəm Allah qarşısında verdiyiniz vədi yerinə yetirmək və mənə tabe olmaq sizə vacib olacaqdır» deyə buyurdu. Onlar bir daha öz vədlərini təsdiqlədilər. Peyğəmbər: «Tövratı Musa – *əleyhissəlam* – nazil edən Allaha and verirəm ki, Yəqub – *əleyhissəlam* – çox şiddətli xəstəliyə tutulmuş (oturaq sinirindən şikayət edirdi) və xəstəliyi uzun müddət davam etdiyinə görə Allaha nəzir etmişdir ki, əgər ona şəfa versə ən sevimli yeməyini və ən sevimli içkisini özünə haram edəcəkdir. Onun ən sevimli yeməyi dəvə əti və onun südüdür» deyə buyurdu. Onlar: «Allaha and olsun ki, bu belədir!» dedilər. Peyğəmbər: «Allahım sən onların dediklərinə şahid ol! Sonra Tövratı Musa – *əleyhissəlam* – nazil edən, heç bir şəriki olmayan Allaha and verirəm ki, kişinin belindən gələn su ağ rəngli qatı maye qadının köksündən gələn su isə sarı rəngli duru mayedir. Bunlardan hansı üstünlük təşkil etsə uşaq Allahın izni ilə üstünlük təşkil edənin cinsindən olar və ona oxşayar. Kişinin belindən gələn su üstünlük təşkil etsə Allahın izni ilə oğlan uşağı, qadının köksündən gələn üstünlük təşkil etsə Allahın izni ilə qız uşağı doğular» deyə buyurdu. Onlar: «Allaha and olsun ki, bu

belədir» dedilər. Peyğəmbər: «Allahım sən onların dediklərinə şahid ol! Sonra Tövratı Musa – *əleyhissəlam* – nazil edən Allaha and verirəm ki, yazıb-oxumağı bacarmayan Peyğəmbərin gözləri yatır, qəlbi isə oyaq qalır» deyə buyurdu. Onlar: «Allaha and olsun ki, bu belədir» dedilər. Onlar: «İndi isə mələklərdən hansının sənin sevimli dostun olduğu barədə bizə xəbər ver, bununla da səni biz ya sənə tabe olaq, ya da səni tərk edək» dedilər. Peyğəmbər: «Həqiqətən də mənim sevimli dostum Cəbrail – *əleyhissəlam* – dır. Allah elə bir Peyğəmbər göndərməyib ki, Cəbrail – *əleyhissəlam* – onun dostu olmasın» deyə buyurdu. Onlar: «Bu yerdə səni tərk etməli olacağıq. Əgər sənin dostun o, yox başqa mələk olsaydı dediyini təsdiq edərdik və sənə tabe olardıq» dedilər. Peyğəmbər: «Sizə dediyimi təsdiq etməyə mane olan nədir?» deyə buyurdu. Onlar: «O, bizim düşmənimizdir (Başqa rəvayətdə: Bizim düşmənimiz olan. Əzab, ölüm və müharibə gətirən Cəbrail: Əgər rəhmət, bitki və yağış gətirən Mikail desəydin doğru olardı) dedilər. Bu zaman ayə nazil oldu: ***«(Ya Muhəmməd!) De: «Kim Cəbrailə düşməndirsə (onu yaxşı bilsin ki) həqiqətən o, özündən əvvəlkiləri (Tövratı və İncili) təsdiq edən, möminləri doğru yola yönəldən, (onlara) müjdə verən Quranı Allahın izni ilə sənin qəlbinə çatdırmışdır». (əl-Bəqərə 97)*****[145].**

## ***Mələklər Və Kafirlər***

Həqiqətən də Allahın mələkləri kafirləri, zalımları, günahkarları sevmirlər. Onlarla vuruşar və qəlblərinə qorxu salarlar.

## ***Mələklərin Kafirləri, Müşrikləri, Münafiqləri Sevməmələri Və Onlara Nifrət Etmələri***

Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Əgər Allah bir qulu sevməzsə əmr edir Cəbrailə: «Şübhəsiz Allah filan qulu sevmir, sən də onu sevmə!» deyə nida edər. Cəbrail də onu sevməz. Sonra Cəbrail da

---

[145] Buxari 8/165, Tirmizi 3117, Əhməd 1/274,278.

səmadakıları səsləyərək: «Şübhəsiz Allah filan qulu sevmir, siz də onu sevməyin!». Səmadakılar da onu sevməzlər. Sonra da yer üzündə olan insanların qəlbində (Allah tərəfindən) o, kimsə haqqında nifrət və kin qoyular»[146].

## ***Mələklər Kafirlərin Canlarını Zorla Alar Və Onları Müjdələyərlər***

***"And olsun (kafirlərin canını) zorla alanlara». (ən-Nəziat 1). «Kaş ki, sən zalimləri ölüm əzabı içində çapalayan, mələklərin də əllərini uzadıb: «Çıxarın canlarınızı! Siz bu gün Allaha qarşı nahaq sözlər danışdığınıza və onun ayələrinə təkəbbürlük göstərdiyinizə görə alçaldıcı bir əzabla cəzalandırılacaqsınız» dediyini görəydin. (əl-Ənam 93). "Kaş sən kafirləri mələklər onların canını alarkən görəydin. Mələklər onların üzünə və yanlarına vura-vura deyirdilər: "Dadın yandırıcı odun əzabını!". (əl-Ənfal 50). "Bəs mələklər onların üzlərinə və arxalarına vura-vura canlarını alanda halları necə olacaq?". (Muhəmməd 27).***

## ***Mələklərin Kafirləri Cəzalandırması***

Nə vaxt ki, insanlar Allahın nazil etdiyi kitablara iman gətirməyib Peyğəmbərini yalanlamışlar Allah bu qövmləri cəzalandırmışdır. Bu cəzanə isə əksər hallarda mələklər icra etmişlər. Məs: Lut – *əleyhissəlam* - ın qövmünün başına gələnlər bizə Qurani kərimdə məlumdur. İbn Kəsir – *rahmətullahi aleyhi* - qeyd edir ki, Mucahid – *rahmətullahi aleyhi* - rəvayət edir ki: "Cəbrail – *əleyhissəlam* - sağ qanadı ilə Lut – *əleyhissəlam* - qövmünü mələklərin itlərin səslərini belə eşidəcək qədər göyə qaldırılaraq altının üstünə çevirir. Sonra başlarına daşlar yağdıran, beləcə heç bir millətə verilməyən əzabın onlara verilməsinə yol açan nə idi? Belə ki, bu əzab onların etdiklərini edənlərə də gələcəkdir[147]. ***"Onlar Lutdan qonaqlarını israrla tələb etdilər. Biz də onları kor etdik və dedik: "Əzabımı və təhdidlərimi dadın!". (əl-Qəmər 37). "Elçilərimiz***

---

[146] Buxari, Müslim.

[147] İbn Kəsir "Bidayə" 1/197.

***Lutun yanına gəldikdə, onlara görə kədərləndi, ürəyi sıxıldı və: "Bu, çox çətin bir gündür"– dedi. Qövmü yüyürərək onun yanına gəldi. Onlar əvvəllər də yaramaz işlər görürdülər. O dedi: "Ey qövmüm! Bunlar mənim qızlarımdır. Onlar sizin üçün daha təmizdirlər. Allahdan qorxun və qonaqlarımın yanında məni rüsvay etməyin! Məgər aranızda ağıllı bir kişi yoxdur?". Onlar dedilər: "Bilirsən ki, sənin qızlarına heç bir ehtiyacımız yoxdur. Nə istədiyimizi də yəqin ki, bilirsən". O dedi: "Kaş ki, sizə çatan bir qüvvəm olaydı, yaxud möhkəm bir dayağa söykənəydim!". Mələklər dedilər: "Ey Lut! Biz sənin Rəbbinin elçiləriyik. Onlar əsla sənə zərər yetirə bilməzlər. Gecənin bir vaxtında arvadından başqa bütün ailənlə yola düş. Qoy içinizdən heç kəs dönüb arxaya baxmasın. Çünki onların başına gələcək müsibət onun da başına gələcəkdir. Onların həlak olmaq vaxtı səhərdir. Məgər səhər yaxın deyilmi?". «Əmrimiz gəldiyi zaman o yurdun altını üstünə çevirdik və üzərinə odda bişmiş, bir-birinə bitişik bərk daşlar yağdırdıq».*** *(Hud 71-82).* Səmud qövmünə tük ürpədici səsin göndərilməsi ilə ən son fərdinə qədər hamısını məhv edən nə idi? ***«Biz onlara bircə dəhşətli, tükürpədici səs (Cəbrailin qışqırtısını) göndərdik, dərhal ağıl düzəldənin istifadə etdiyi quru ota döndülər». (əl-Qəmər 31).***

## *Mələklərin Kafirləri Lənətləməsi*

***"İman gətirdikdən, Peyğəmbərin həqiqi peyğəmbər olduğuna şahid olduqdan və özlərinə aydın dəlillər gəldikdən sonra kafir olan adamları Allah necə doğru yola yönəldər? Allah zalım adamları doğru yola yönəltməz. Onların cəzası, şübhəsiz ki, Allahın, mələklərin və bütün insanların onları lənətləməsidir". (Ali İmran 86-87). "Kafir olub kafir kimi də ölənlərə Allahın, mələklərin və bütün insanların lənəti olsun!". (əl-Bəqərə 161).***

## *Mələklər Ərinə İtaət Etməyən Qadını Lənətləyir-lər*

Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ər öz yoldaşını yatağa dəvət

etdiyi halda qadın itaətsizlik edib gəlməzsə və əri qəzəbli yatarsa mələklər səhərə qədər o qadını lənətlyərlər (Başqa rəvayətdə: Qadın yatağa qayıdana qədər)»[148].

## ***Mələklər Qardaşının Üstünə İti Bir Şey Uzadanı Lənətliyirlər***

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim bir müsəlman qardaşını (qorxutmaq niyyətilə) dəmir silah ilə işarə edərsə doğma qardaşı olasa da belə silahı əlindən buraxana qədər Allahın mələkləri ona lənət edərlər»[149].

## ***Mələklər Səhabələri Təhqir Edənləri Lənətləyirlər***

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mənim səhabələrimi söyənə Allahın, mələklərinin və bütün insanların lənəti çatar»[150].

## ***Mələklər Bidət Əhlinə Sığınacaq Verəni Lənətə-yirlər***

Əli - *radıyallahu anhu* – rəvayət edir ki: «Bizdə Allahın Kitabı və (əlimdə) olan bu səhifədən başqa bir şey yoxdur. Səhifənin içində Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in belə buyurduğu yazılmışdır: «Mədinənin Ayr və Sevr dağları ərazisindəki sahəsi haramdır. Hər kim Mədinənin bu haram daxilində Kitab və Sünnətə müxalif olan (günah[151]) edərsə və ya bir bidətçiyə yardım edərsə artıq Allahın, mələklərin və bütün insanların lənəti onun üzərinə olar və ondan nə fərz, nə də nafilə qəbul olunar[152].

---

[148] Buxari, «Fəthul Bəri» 6/314, Müslim.

[149] Müslim 2617.

[150] Təbərani, əl-Albani «Səhhul Cəmi» 6285.

[151] Asim əl-Əhvəl deyir ki, mən Ənəs - *radıyallahu anhu* – dan: «Rəsulullah – *sallallahu aleyhi və səlləm* – dən Mədinəni haram etdimi?» deyə soruşdum. Ənəs: «Bəli, Mədinə haramdır. Onun bitkisi qoparılmaz. Hər kim belə bir günahı edərsə artıq Allahın, mələklərin və bütün insanların lənəti onun üzərinə olar (Başqa rəvayətdə: Ya Allahım! Şübhə yox ki, İbrahim Sənin qulun, xəlilin və Peyğəmbərindir. Mən də Sənin qulun və Peyğəmbərinəm. İbrahim Məkkə üçün Sənə dua etdi. Mən də onun Məkkə üçün istədiklərini və bir mislini Səndən Mədinə üçün istəyirəm. Bərəkətindən Məkkəyə bəxş etdiyin lütfündən iki mislini Mədinəyə də müyəssər et)» Müslim 1367, 1368, 1373.

[152] Buxari 1870, Müslim 1370. Əbu Davud 2034, 2036 əl-Albani "Səhih".

## ***Mələklər Özünü Atasından Başqasına Nisbət Edənləri Lənətləyirlər***

Əli - *radıyallahu anhu* – rəvayət edir ki: «Bizdə Allahın Kitabı və (əlimdə) olan bu səhifədən başqa bir şey yoxdur. Səhifənin içində Peyğəmbər – *sallallahu aleyhi və salləm* – belə buyurduğu yazılmışdır: Müsəlmanlar tərəfindən verilən (qorunmaq) zəmanəti birdir və hər kim bu işdə müsəlmanları badə verərsə artıq Allahın, mələklərin və bütün insanların lənəti onun üzərinə olar və ondan nə fərz, nə də nafilə qəbul olunar. Hər kim atasından başqasına nisbət edərsə özünü artıq Allahın, mələklərin və bütün insanların lənəti onun üzərinə olar və ondan nə fərz, nə də nafilə qəbul olunar»[153].

## ***Mələklər Allahın Hökmünün Həyata Keçməsinə Maneçilik Edənləri Lənətliyirlər***

İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «Əgər insan təsadüf nəticəsində atılan bir daşdan, taxtadan öldürülərsə onun kəffarəsi təsadufi ölüm kimi olur (Başqa rəvayətdə: Belə bir kimsənin kəffarəsi 100 dəvə və bu dəvələrdən qırxı qarnı balalı olmalıdır[154]) Əgər bir kimsə bilə-bilə, qəsdli şəkildə öldürülərsə onda qisas almaq lazımdır. Kimsə bu işə maneçilik törətməyə çalışarsa onun üzərinə Allahın lənəti nazil olar (Başqa rəvayətdə: Mələklərin və bütün insanların lənəti olar)»[155]. Əbu Burza - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «Xəlifəlik Qureyşdən olmalıdır. Onlardan rəhm istənildikdə onlar mərhəmətli olmalıdırlar. Vəd verdikləri zaman vədlərini yerinə yetirməlidirlər. Hökm oxuduqda ədalətli olmalıdırlar. Əgər kimsə bu cür hərəkət etməzsə onun üzərinə Allahın, mələklərin və bütün insanların lənəti yağar»[156].

---

[153] Buxari 1870, Müslim 1370.

[154] «Buluq əl-Məram» 1179.

[155] «Buluq əl-Məram» 1169.

[156] İmam Əhməd «Musnəd» 4/421, əl-Albani «İrvalul Ğəlil» 2/301.

## Mələklər Və Kafirlər

***“Bizimlə qarşılaşacaqlarını güman etməyənlər dedilər: "Nə üçün bizə mələklər göndərilmədi? Niyə biz Rəbbimizi görmürük?" Onlar özləri haqqında yüksək fikirdə oldular və böyük üsyankarlıq etdilər. Məhz mələkləri görəcəkləri gün günahkarlara heç bir müjdə olmayacaqdır. Mələklər deyəcəklər: "Cənnətə girməyiniz qadağandır, qadağan!". (əl-Furqan 21-22).***

## Mələklər Və İnsanlar – Kim Üstündür?

İbn Kəsir – *rahmətullahi aleyhi* - qeyd edir ki: “Bu barədə müsəlmanlar arasında fikir ayrılığı vardır. Ömər İbn AbdulƏziz – *rahmətullahi aleyhi* - deyir ki: “Heç bir məxluq Allah dərgahında Adəm övladı kimi hörmətə layiq deyildir: ***“Şübhəsiz ki, iman gətirib yaxşı işlər görənlər məxluqların ən yaxşısıdırlar”. (əl-Bəyyinə 7).*** Umayya İbn Amr İbn Səid deyir ki: “Mən bununla razıyam”. Lakin Arrak İbn Məlik – *rahmətullahi aleyhi* - deyir ki: “Allah yanında mələklər qədər heç kəs hörmətli deyidir: ***“Rəbbiniz sizə bu ağacı yalnız ona görə qadağan etmişdir ki, siz mələk və ya Cənnətdə əbədi qalanlardan olmayasınız”. (əl-Əraf 20).*** Bu zaman Ömər İbn AbdulƏziz, Muhəmməd İbn Kəb əl-Qurayzidən soruşur: “Ey Əbu Həmzə! Sən nə deyirsən?”. O: “Allah Adəmi ucaldaraq onu öz əlləri ilə xəlq etdi, ona öz ruhundan üfürdü, Mələklərə də ona səcdə etməyi əmr etdi, onun nəslindən mələklərin nazil olduğu peyğəmbərlər və elçilər göndərdi” dedi[157]. Qeyd edilir ki, Kəlamçılar çıxmamışdan qabaq Sələflər bu cür sualları müzakirə etməzdilər. Abdullah İbn Salam – *radıyallahu anhu* - deyir ki: “Muhəmməd – *sallallahu aleyhi və səlləm* – kimi Allah dərgahında tərif olunan (həmd olunan) bir kimsə yoxdur”. Ondan: “Hətta Cəbrai və Mikaildəndə” deyə soruşdular. O: “Bilirsənmi Cəbrail və Mikail - *əleyhimussəlam* - kimdir? Onlar da Günəş və Ay kimi Rəbbinə itaətkar məxluqlardır. Muhəmməd – *sallallahu aleyhi və səlləm* – kimi Allah dərgahında tərif olunan (həmd olunan) bir

---

[157] İbn Kəsir “Bidayə” 1/58.

kimsə yoxdur"[158]. Bəziləri qeyd edirlər ki: "Yalnız Peyğəmbərlər və salehlər mələkləri qabaqlayırlar". İmam Əbu Hənifə – *rahmətullahi aleyhi* - isə bu suala cavab verməkdən çəkinmişdir[159]. İmam Əhməd – *rahmətullahi aleyhi* - deyir ki: "Mələklərin üstün olduğunu söyləyən səhf etmişdir. Hər bir mömin mələkdən üstündür"[160]. Heç şübhə yox ki, kafirlər və münafiqlər mələklərlə müqayisə edilməz. ***"Biz Cəhənnəm üçün bir çox cinlər və insanlar yaratdıq. Onların qəlbləri var, onunla anlamazlar; gözləri var, onunla görməzlər; qulaqları var, onunla eşitməzlər. Onlar heyvan kimidirlər, hətta daha çox azğınlıqdadırlar. Qafil olanlar da məhz onlardır". (əl-Əraf 179).***

Bu ayə Adəm - *əleyhissəlam* - ın İblisdən və Mələklərdən üstün olduğunu göstərir. ***"Bir zaman Biz mələklərə: "Adəmə səcdə edin!"– dedikdə, İblisdən başqa hamısı səcdə etdi O imtina edib təkəbbür göstərdi və kafir oldu". (əl-Bəqərə 34). "Sənin Rəbbin mələklərə: "Mən yer üzündə bir canişin bərqərar edəcəyəm!"– dedikdə, onlar: "Biz Səni həmd-səna ilə tərifl̇ədiyimiz və Səni müqəddəs tutduğumuz halda, Sən orada fəsad törədib qan salacaq bir kəsmi yerləşdirəcəksən?"– söylədilər O dedi: "Şübhəsiz ki, Mən sizin bilmədiklərinizi bilirəm!". (əl-Bəqərə 30).*** Uca və Böyük olan Allahın salehlərlə Mələklərin qarşısında öyünməsi: Abdullah İbn Amr – *radıyallahu anhu* - rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ilə bərabər axşam namazını qıldıqdan sonra evinə dönən döndü, gözləyən isə (məsciddə) oturub gözlədi. Bir müddətdən sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – diz qapaqları açılmış, tez-tez nəfəs alaraq qaçaraq gəldi və: "Müjdələr, Rəbbiniz səma qapılarından bir qapını açmış mələklərin qarşısında sizinlə öyünərək onlara: "Bu qullarıma baxın – bir fərzi qıldıqdan sonra digər fərzi gözləyirlər" deyə buyurdu[161]. Əbu Hureyrə və Əbu Səid – *radıyallahu anhum* - Peyğəmbər – *sallallahu aleyhi və*

---

[158] Həkim "Mustədrək", İbn Əbil İzz "Şərh Tahaviyyə" səh: 305.

[159] "Şərh Təhaviyyə" səh: 303.

[160] əs-Səffərini "Ləvəmi" 2/səh: 398.

[161] İbn Məcə 801, əl-Albani «Səhih Cəmi» 36.

*səlləm* – in belə buyurduğuna şahidlik etmişlər: “Bir məsciddə oturub Allahı zikr edən hər (müsəlman) cəmaatını mələklər əhatəyə alar, onlara rəhmət qapıları açılar və səkinə onların üzərinə enər və Allah qatında olan (mələklər) yanında onlardan söz açar”[162]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “Uca Allah səma əhli yanında Ərafətdə duranlarla öyünər və onlara: “Mənim qullarıma bir baxın. Onlar Mənim hüzuruma dağılmış və toza bulaşmış saçları ilə gəliblər”[163]. Ubadə İbn Samit - *radıyallahu anhu* – demişdir: “(Bir gün) Allah Elçisi – *sallallahu aleyhi və səlləm* – bizimlə namaz qılırdı. (Bu zaman) biri Ənsardan, biri isə Səqif qəbiləsindən olan iki kişi ona doğru addımladı və Ənsardan olan kişi Səqif qəbiləsindən olan kişini (Allah Elçisi – *sallallahu aleyhi və səlləm* – ə birinci yaxınlaşmaqda) qabaqladı. Allah Elçisi – *sallallahu aleyhi və səlləm* – Səqifdən olan kişiyə dedi: “Ənsar soruşmaqda səni qabaqladı”. Ənsar dedi: “Ola bilsin ki, o, məndən çox tələsir, qoy (birinci) soruşsun”. Səqif qəbiləsindən olan kişi namaz haqqında soruşdu, o da ona xəbər verdi. Sonra Allah Elçisi – *sallallahu aleyhi və səlləm* – Ənsara dedi: “Əgər istəyirsənsə, soruşmaq üçün gəldiyin məsələ barəsində sənə xəbər verim”. O dedi: “Ey Allahın Elçisi! Mənə xəbər ver!” O dedi: “Sən gəldin ki, məndən soruşasan; “qədim Evə (Kəbəyə) gəlməyinin, Ərafatda durmağının, daş atmağının, başını qırxdırmağının və Ev ilə vidalaşmağının sənin üçün mükafatı nədir?” Ənsar dedi: “Səni haqq ilə göndərən Allaha and olsun ki, mən səndən bundan başqa (bir məsələ) haqqında soruşmağa gəlmədim”. O dedi: “Qədim Evə gəlməkdə sənin mükafatın sənin və miniyinin atdığı hər addıma görə sənə bir savab yazılar və sənin üçün bir dərəcə artırılar. Ərafatda durduqda Allah mələklərinə buyurar: “Ey Mənim mələklərim! Mənim qullarımı bura gətirən nədir?” Mələklər deyirlər: “Onlar Sənin

---

[162] Tirmizi 3378, İbn Məcə 3791, əl-Albani “Səhih”.

[163] İbn Hibban “Səhih” 3852, Şueyb Arnavut “Səhih”, Beyhəqi “Sünən”, Həkim “Müstədrək”, əl-Albani “Səhih Cəmi” 1867.

razılığını və Cənnəti istəyirlər”. Allah buyurar: “Mən Özümü və məxluqatımı şahid tuturam ki, Mən onları zamanın günlərinin, (yağışın) damcılarının, qum dənəciklərinin sayı qədər bağışladım!” Daş atdıqda Allah buyurar: ***“Etdikləri əməllərin mükafatı kimi onlar üçün gözlərinə sevinc gətirəcək nələr saxlandığını heç kəs bilmir”. (əs-Səcdə 17).*** Başını qırxdırdıqda isə yerə düşən hər bir tükün Qiyamət günü sənin üçün nur olacaq. Ev ilə vidalaşdıqda sən anadan doğulduğun gündə olduğun kimi günahlarından azad olarsan”.[164] Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – səhabələrin oturduğu bir toplumun yanına çıxaraq buyurdu: “Sizi burada oturdan səbəb nədir?”. Onlar: “Allahı zikr edib Ona həmd etmək və bizi İslam üzərə hidayət etdiyi üçün və bizə lütfü ilə müamələ etdiyi və bizə hər cür nemətləri verdiyi üçün həmd edib, şükr etmək üçün oturduq” dedilər. Peyğəmbər: “Allah haqqı üçün sizi burada oturdan səbəb budurmu?” deyə buyurdu. Onlar: “Bəli, Allah haqqı üçün bizi oturdan səbəb yalnız budur” dedilər. Peyğəmbər: “Diqqətli olun, sizə qarşı bir töhmət olsun deyə and içməyinizi istəmirəm. Cəbrail – *əleyhissəlam* - mənim yanıma gələrək mələklərə qarşı Allahın sizinlə öyündüyünü bildirdi” deyə buyurdu[165]. Abdullah İbn Amr və İbn Ömər - *radıyallahu anhum* – rəvayət edirlər ki: “Uca Allah Cənnəti yaratdıqda mələklər dedilər: “Ey Rəbbimiz, bunu bizim üçün et, Adəm övladı üçün dünyanı yaratmısan. Onlar orada yeyir və içirlər”. Allah: “İzzətimə və Ucalığıma and olsun! Öz əllərimlə yaratdığım bəndənin əməlisaleh nəslini “Ol” deməklə olan bir tayfaya bərabər tutmaram”[166].

Mələklərin üstün olduğunu söyləyənlər isə: ***“...Mən sizə demirəm ki, mən mələyəm...”. (əl-Ənam 50).*** Əbu Hureyra - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “Uca Allah buyurur: “Mən qulumun barəmdəki zənni yanındayam. Məni yad etdikcə onunlayam. O Məni öz-

---

[164] Təbərani “Mucəmul-Əvsat” 2320, əl-Albani “Sahihut-Tərğib vət-Tərhib” 1113 həsən li-ğeyrihi demişdir.

[165] Müslim 2701, 7032, Nəsəi 5426, Tirmizi 3379, Əhməd 16881, 16835.

[166] Dərimi “Rədd Alə Bişrul Mərrisi” 1/256, Səlim Hiləli “Movquf” hədis.

özlüyündə yad etsə, Mən də onu Öz-Özlüyümdə yad edərəm. O Məni camaatın yanında yad etsə, Mən onu onlardan daha xeyirli camaatın (mələklərin) yanında yad edərəm. O Mənə bir qarış yaxınlaşsa, Mən ona bir dirsək yaxınlaşaram. O Mənə bir dirsək yaxınlaşsa, Mən ona bir qulac yaxınlaşaram. O Mənə doğru yeriyərək gəlsə, Mən ona doğru yüyürərək gələrəm"[167].[168].

**Son Söz -** bütün bunlara iman gətirmək vacibdir. Buna görə də mələklərə iman etmək, imanın əsaslarını təşkil edən altı əsasdan biridir.

---

[167] Buxari 97, Kitəbut-Tövhid 6856, 7405, Muslim 4/ 2061.
[168] Bax: "Məcmuul Fətava" 11/350, "Şərh Əqidətul Təhaviyyə" səh: 303.

# İSTİFADƏ OLUNAN ƏDƏBİYYAT

***«Qurani Kərim»*** Tərcümə - Ziya Bünyadov və Vasim Məmmədəliyev.
***"Qurani Kərim"*** Tərcümə - Əlixan Musayev.
***«Sələsətil Usul»*** Muhəmməd İbn Saleh əl-Useyminin şərhi ilə - Türk Dilində.
***«Aləmus Sunnətul Mənşura»*** Hafiz b. Əhməd əl-Həkəmi - Türk dilində.
***«əl-Vəciz Fi Əqidətul əs-Sələfi əs-Salihin»*** Abdullah İbn AbdulHəmid əl-Əsəri - Türk Dilində.
***«əl-Əqidətul Təhaviyyə»*** İbn Əbil İzz əl-Hənəfinin şərhi ilə - Türk Dilində.
***«əl-Əqidətul Təhaviyyə əl-Muyəssər»*** Muhəmməd əl-Humeyyisin şərhi ilə - Türk Dilində.
***«əl-Əqidətul Vasitiyyə»*** İbn Teymiyyə. Muhəmməd Xəlil Hərrasın şərhi ilə - Türk Dilində.
***«Ərbəin ən-Nəvəviyyə»*** Nazim Məhəmməd Sultanın şərhi ilə - Türk Dilində.
***«Əhli Sünnə Vəl Cəmaatın Etiqadi Özəllikləri»*** Muhəmməd AbdulHadi əl-Misiri - Türk Dilində.
***«Əhli Sünnətə Görə İman»*** Abdullah İbn AbdulHəmid əl-Əsəri - Türk Dilində.
***«Мир Благочестивых Ангелов»*** Умар Сулейман ал-Ашкар – Перевод с Арабского Э.Р.Кулиева.
***«Müxtəsər Səhih Buxari»*** Muhəmməd İbn İsmail Əbu Abdullah əl-Buxari əl-Cufi - Tərcümə - Əlixan Musayev.
***«Müxtəsər Səhih Muslim»*** Əbul-Hüseyn Muslim İbn Həccəc İbn Muslim əl-Quşayri ən-Nisaburi – Tərcümə - Anar İsrafilov.
***"Səhih Buxari"*** Muhəmməd İbn İsmail Əbu Abdullah əl-Buxari əl-Cufi *Ərəb və Türk dillərində*
***«Səhih Muslim»*** Əbul-Hüseyn Muslim İbn Həccəc İbn Muslim əl-Quşayri ən-Nisaburi *Ərəb Və Türk dillərində*
***«Sünən-Tirmizi»*** Muhəmməd İbn İsa Əbu İsa ət-Tirmizi əs-Suləmi, *Dəru İhyəit-Turasil-Arabi, Beyrut çapı.* Muhəmməd Nəsirəddin əl-Albaninin təhqiqi ilə
***«Sünən Əbu Davud»*** Suleyman İbn əl-Əşəs Əbu Davud əs-Sicistani əl-Əzdi, *Dərul-Kitəbil-Arabi, Beyrut çapı.* Muhəmməd Nəsirəddin əl-Albaninin təhqiqi ilə

***«Sünən-Nəsai»*** Əhməd İbn Şueyb Əbu Abdurrahmən ən-Nəsai, *Məktəbul-Mətbuatil-İsləmiyyəti, Hələb çapı, ikinci nəşr, M1986-H1406.* Muhəmməd Nəsirəddin əl-Albaninin təhqiqi ilə

***«Sünən ibn Macə»*** Muhəmməd İbn Yəzid Əbu Abdullah əl-Qəzvini, *Dərul-Fikr, Beyrut çapı,* Muhəmməd Nəsirəddin əl-Albaninin təhqiqi ilə

***«Səhih ibn Hibban»*** Muhəmməd İbn Hibban İbn Əhməd Əbu Hatim ət-Təmimi, *Muəssəsətul-Risələ nəşriyyatı, ikinci nəşr M1993-H1414*, Şueyb əl-Arnavutun təhqiqi ilə

***«Musnəd Əhməd»*** Əhməd İbn Hənbəl, *Muəssəsətul-Risələ, ikinci nəşr, M1999-H1420*

***«Musnəd Əhməd»*** Əhməd İbn Hənbəl, *Muəssəsətu Qurtubə, Qahirə çapı*, Şueyb əl-Arnavutun təhqiqi ilə

***«Silsilətul-Əhədisis-Sahiha»*** Muhəmməd Nəsirəddin əl-Albani, *Məktəbətul-Məarifə, ər-Riyad*

***"Silsilətul Əhədisə Daifə və Movdua və Əsəruhə Fi Umməti"*** Muhəmməd Nəsirəddin əl-Albani, *Məktəbətul-Məarifə, ər-Riyad*

***«Sahih və Daif Cəmius-Sağir»*** Muhəmməd Nəsirəddin əl-Albani, *Məktəbətul-İsləmi*

***«Sahihut-Tərğib vət-Tərhib»*** Muhəmməd Nəsirəddin əl-Albani, *Məktəbətul-Məarif, ər-Riyad, beşinci nəşr*

***«Mişkətul-Məsabih»*** Muhəmməd İbn Abdullah əl-Xatib ət-Təbrizi, *Məktəbətul-İsləmi, ikinci nəşr, Beyrut M1985-H1405.* Muhəmməd Nəsirəddin əl-Albaninin təhqiqi ilə

***«İrvaul-Ğalil fi Təxric Əhədis Mənaras-Səbil»*** Muhəmməd Nəsirəddin əl-Albani, *Məktəbətul-İsləmi, ikinci nəşr, Beyrut M1985-H1405*

